## REDAKSİYA HEYƏTİ

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR



## TƏBİƏT ELMLƏRİ

**HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR**

**HUMANITIES AND SOCIAL SCIENCES**

https://doi.org/10.36719/2663-4619/111/9-14

**Zənfira Quliyeva**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
tarix üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0003-4888-9152
zenfira.qulliyeva@mail.ru

# XX əsrin 20-30-cu illərində Azərbaycan neft sənayesinə retrospektiv baxışlar kontekstində dəyərləndirmələr

**Xülasə**

Azərbaycandan neft ixracı ilə əlaqədar ilk məlumatlar X əsrə aid edilir. Həmin dövrdə Abşeron yarımadasında 10-12 metr dərinlikdə quyular qazılırdı. 915-ci ildə Bakıya gəlmiş Məsudi yazırdı ki, "Bakıya ağ neft mədənlərindən neftin aparılması üçün tacirlər gəlirlər. Dünyada ağ neft çıxarılan elə bir yer yoxdur". Abşeron mədənlərində neft yataqlarının sənaye üsulu ilə mənimsənilməsinin başlanğıc mərhələsi XVIII əsrdən 1917-ci ilə əlaqədar olan dövrü əhatə edir. Sonrakı mərhələ sovet dövrü kimi xarakterizə olunur. Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra 1920-ci il mayın 7-dən neft sənayesinin sovet dövrü başlanır və müstəqilliyin yenidən bərpasına qədər olan illəri əhatə edir. Nəhayət, neft sənayesinin üçüncü mərhələsi Azərbaycan Respublikasının müstəqillik illərini, müasir dövrü əhatə edir. Məqalədə Azərbaycan neft sənayesinin ikinci mərhələsində, daha doğrusu, XX əsrin 20-30-cu illərində neft sənyesində institusional situasiya, neft sənayesinin iqtisadi məsələləri ilə əlaqədar dəyərləndirmələr araşdırılır.

***Açar sözlər:*** *neft sənayesi, neft hasilatı, Azneft, trest, neft kombinatı*

**Zanfira Guliyeva**
Azerbaijan State Oil and Industry University
PhD in History
https://orcid.org/0009-0003-4888-9152
zenfira.qulliyeva@mail.ru

# Evaluations in the Collection of Retrospective Reviews of the Azerbaijan Oil Industry in the 20s-30s of the 20th Century

**Abstract**

The first information about oil export from Azerbaijan dates back to the 10th century. At that time, wells with a depth of 10-12 meters were dug in the Absheron Peninsula. Masudi, who came to Baku in 915, wrote that merchants come to Baku to take oil from white oil fields. There is no such place in the world where white oil is produced. The initial stage of exploitation of oil fields in Absheron mines by industrial method covers the period from the 18th century to 1917. The next stage is characterized as the Soviet period. After the establishment of Soviet power in Azerbaijan, the Soviet period of the oil industry began on May 7, 1920, and covered the years until the restoration of independence. Finally, the third stage of the oil industry covers the years of independence of the Republic of Azerbaijan, the modern era. The article examines the institutional situation in the oil industry in the second stage of the Azerbaijani oil industry, more precisely in the 20s and 30s of the 20th century, and the evaluations related to the economic issues of the oil industry.

***Keywords:*** *oil industry, oil production, Azneft, trust, oil combinate*

## Giriş

1920-ci il mayın 7-dən neft sənayesinin sovet dövrü başlanır (Serikova & Zulfuqarova, 2013, s. 15). Azərbaycan neft sənayesi 1920-ci ilin mayın 24-də yenidən milliləşdirildi. Serebrovski Moskva tərəfindən neft komitəsinə sədr göndərildi. 1920-ci ildə aprelin 20-də neft çənləri ilə dolu ilk karvan Bakıdan Həştərxana göndərildi. Rusiya Sovet Respublikasında yeni bərqərar olmuş bolşevik hökuməti Bakı neftinin üzərində sahibkar kimi hərəkət edirdi (İsmayılov, 2007, s. 22).

**Tədqiqat**

Neft sənayesində mövcud kolonialist situasiyanın xarakterizə edilməsi baxımından N.Nərimanovun "Sovet Azərbaycanı özü könüllü olaraq neftin Sovet Rusiyası zəhmətkeşlərinə mənsub olduğunu elan etmişdi, lakin Sovet respublikasında başda "kral" Serebrovski olmaqla "monarxiya" yaratmaq nəyə lazım idi (Nərimanov, 1992, s. 27) sözləri respublikada mövcud vəziyyəti dəqiq ifadə edir. Deyilən fikrin əlavə olaraq tamamlanması üçün təkcə bir faktın qeyd edilməsi yerinə düşərdi ki, 20-30-cu illərdə SSRİ-də istehsal edilən bütün neftin 60-80 %-i Bakıda istehsal edilirdi (Azərbaycan SSR Xalq Təsərrüfatı Statistika külliyyatı, 1957, s. 41). Neft və neft məhsulları SSRİ-nin ixrac məhsulları içərisində mühüm və strateji məhsullardan biri idi.

Daha sonra qeyd etmək lazımdır ki, 1921-ci il sentyabrın 1-də Rusiya Sovet Federasiyası Sosialist Respublikasının Ali Xalq Təsərrüfatı Şurasına tabe olan Azneft tresti yaradıldı. Azneft Abşeron yarımadasında, Balaxanı, Sabunçu, Ramana, Bibi-Heybət, Suraxanı və Binəqədi neft mədənlərində hasilat işini təşkil edirdi (Izvestiya Obshchestva izucheniya i issledovaniya Azerbaydzhana, 1925, s. 141; Tokarzhevskiy, 1949, s. 340).

Qeyd etmək lazımdır ki, 1922-ci ildə Azərbaycanda 41 müəssisə trestləşdirilmişdi və onlar 10 trestin tərkibində Azərbaycan AXTŞ-nın tabeçiliyinə keçdilər. Lakin neft sənayesinə daxil olan müəssisələr RSFSR-in AXTŞ-nın tabeçiliyində idilər (Smelov, 1966, s. 18).

1923-cü ildə avqustun 27-də trestləşdirilmiş Azneftin yeni əsasnaməsi işıq üzü gördü. Qeyd etmək lazımdır ki, sözügedən əsasnamə trestlər haqqında 10 aprel ümumi əsasnaməyə uyğun tərtib edilmişdi və artıq iyul ayında ictimaiyyət əsasnamənin layihəsi ilə mətbuat vasitəsi ilə tanış edilmişdi. Trest AXTŞ-nin tərkibindəki baş idarəyə *(Baş Yanacaq İdarəsi*) tabe idi. Əsasnamədə yazılırdı ki, trest bütün təsərrüfat işlərini öz adından hüquqi subyekt kimi gerçəkləşdirir. Dövlət trestin borclarına cavabdeh deyildi. Trestin *əsas kapitalı* – mədənlər, neft anbarları, zavod və yardımçı müəssisələr, neft boruları, qurğular, nəqliyyat vasitələri, *dövriyyə kapitalı* – neft və neft məhsulları, pullar, qiymətli kağızlar, dövlət tərəfindən buraxılmış pul və qiymətli vəsaitlər idi. Azneftin balansında olan əmlakın amortizasiya qaydaları aşağıdakı kimi müəyyən edilmişdi (Nəriman, 1992). Əsaslı tikinti qurğuları hər il ilkin dəyərinin 5 %-nin ödənilməsi ilə, müvəqqəti xarakterli qurğular dəyərinin 10 %-nin ödənilməsi ilə, fəaliyyətdə olan buruqlar və quyular üçün 20 %, fəaliyyətdə olmayanlar üçün isə 2,5 %-i ödənilməklə amortizasiya edilməli idi. Bundan əlavə, ehtiyat fondu üçün mənfəətin 20 %-nin ödənilməsi nəzərdə tutumuşdu. Bu fond zərərləri və istehsalın genişləndirilməsi ilə əlaqədar xərcləri qarşılamaq üçün yaradılmışdı. Azneftin ləğv edilməsi isə aşağıdakı hallarda həyata keçirilə bilərdi:

- əsas kapitalin 5/2 hissəsinə qədər azalması;
- borclarının ödənilməsi üçün dövriyyə vəsaitlərinin tükənməsi;
- Azneftin fəaliyyətinin direktiv orqanlar tərəfindən məqsədəuyğun olmaması qənaətinin çıxarılması zamanı (Azerbaydjanskoe neftyanoe xozyaystva, 1923, s. 35-38).

Trestin idarə edilməsi AXTŞ tərəfindən təsdiq edilmiş və baş idarə tərəfindən 1il müddətinə təyin edilmiş rəis tərəfindən həyata keçirilirdi (Azerbaydjanskoe neftyanoe xozyaystva, s. 5-7)

Trestin tərkbində bir sıra təsərrüfat birlik və orqanları mövcud idi. Bunlar aşağıdakılar idi:

1. *Mərkəzi hasilat idarəsi* – Balaxanı, Sabunçu, Ramana, Suraxanı, Bibi-Heybət, Binəqədi neft rayonlarında hasilat, qazma, geoloji-kəşfiyyat, texniki işləri idarə edirdi.
2. *Neftin emalı idarəsi*
3. *Yardımçı müəssisələr idarəsi* – buraya əsasən neft işi ilə əlaqədar yardımçı müəssisələr daxil idi. Nümunə kimi elektromexanika, mexanika, nəqliyyat müəssisə və təsərrüfatları göstərilə bilər.
4. *Əmtəə idarəsi*;
5. *Kommersiya idarəsi* – tərkibində mühasibat, texniki təchizat, ekspedisiya kontoru, neft satışı şöbələri yaradılmışdı;

6. *Kommunal idarə* – tərkibində tibbi-sanitar, texniki, xalq maarifi (savadsızlığın ləğvi, mədənəniyyət və klub işi, uşaq evləri və bağçaları bölmələri) şöbələrindən ibarət idi;
7. *Ticarət idarəsi* – İran, Zaqafqaziya və Xəzərətrafı, Rusiya şöbələrindən ibarət idi;
8. *Texniki büro;*
9. *Baş mühasibatlıq;*
10. *Neft satışı idarəsi* (Prodneft) – bu idarə kommersiya idarəsinin tərkibindəki bölgü şöbəsi əsasında yaradılmışdır;
11. *Ekspedisiya Kontoru* – Kommersiya idarəsindən ayrılaraq müstəqil idarə kimi fəaliyyət göstərmişdir. Tərkibində – dəmir yolu, teleqraf, araba nəqliyyatı şöbələri var idi;
12. *Hüquqi bölmə;*
13. *Smeta-texniki bölməsi;*
14. *Tarif və əmək haqqı bölməsi* (Azerbaydzhanskaya neftyanaya promyshlennost, 1923, s. 33-34)

Qeyd etmək lazımdır ki, Azneftin tərkibində müvafiq sturktur dəyişiklikləri demək olar ki, hər ay müşahidə edilirdi. Bütün bunlara baxmayaraq, yuxarıda göstərilən stuktur nisbi də olsa, Azneftin 1923-cü il üçün əsas strukturu hesab edilə bilər. Bütün bu təsisatlar Azneftin tərkibində yaradılan Böyük Komitəyə tabe idi. 1923-cü il 5 noyabr əsasnaməsinə görə, komitəyə Azneftin rəisi və onun müavini, bütün iri idarə və şöbələrin rəisləri və rəis müavinləri, Azneftin baş mühasibi, Texniki büronun müdiri, Mərkəzi Mədənçilər İdarəsinin nümayəndəsi, partiya təmsilçisi və Fəhlə-kəndli Müfəttişliyinin nümayəndəsi daxil idi. Böyük Komitənin iclası fövqəladə toplantılar nəzərə alınmazsa, ayda bir dəfə keçirilməkdə idi. Eyni zamanda Azneftin tərkibində Kiçik Komitə də var idi ki, buraya Azneftin rəisi və onun müavinləri daxil idi. Qeyd edildiyi kimi, Azneftin işçi aparatına idarə rəisi və onun yoxluğu zaman rəis müavini rəhbərlik edirdi. Deyilənlərlə yanaşı, sözügedən təsisatda texniki, kommersiya və ticarət, hasilat, tarif işləri üzrə direktorlar fəaliyyət göstərirdi ki, onlar da Azneftin müvafiq sahələr üzrə işlərin icrasında məsul şəxslər hesab edilirdilər (Azerbaydzhanskaya neftyanaya promyshlennost, 1923, 30-31).

Daha sonra 1925-ci ildən Azərbaycan neft sənayesinin idarə edilməsi işinin təşkilində müəyyən dəyişikliklər oldu. Neft sənayesinin idarə edilməsi aşağıdakı strukturda təşkil edilirdi:

**I Baş Kontor** – *A.* Texniki Büro-1) istismar söbəsi (1928-1933-cü illər üçün hasilat və qazma işləri proqramını tərtib edirdi. 2) Layihə şöbəsi (tərkibində mexaniki, elektromexaniki seksiyalar, konstruktor bürosu, plan, smeta-texniki şöbələr)

*B.* Baş mühasibatlıq 1) hesabat, 2) təlimat, 3) mühasibat, 4) nəzarət, 5) əməliyyat-kassa, 6) maliyyə-smeta,7) inventar şöbələri.

**II Əsas İstehsal İdarəsi** - A. Geoloji-Kəşfiyyat Bürosu 1) qazma və istismar işinə nəzarət, 2) kəşfiyyat işləri, 3) geoloji-statistika şöbələri, 4) markşeyder bürosu (tərkibinə qazma, neft hasilatı, qapalı istismar sistemi, neftayırma zavodları, əmtəə idarəsi – (dəniz və dəmir yolu vasitəsi ilə daşınmalar, texniki şöbə, neftin ötürülməsi və saxlanılması, mavi yanacağın hasilatı və istismarı) qurumları daxil idi.

**III Azneftə xidmət edən yardımçı müəssisələr** – 1). Elekrotok, 2) Texniki Təchizat, 3) Utilizasiya şöbəsi, 4) İstilik şöbəsi, 5) Yaxın Şərq rayonu üzrə Neft Sindikatı İdarəsi.

Sonrakı illərdə neft sənayesində idarəetmə aparatında nəzərəçarpacaq dəyişikliklər 30-cu illərdə diqqəti cəlb edir. Daha doğrusu, 1933-cü ildə "Azneftin" mərkəzi aparatında 8 idarə ləğv edildi, əvəzində 350 ştat vahidi olan 9 idarə yaradıldı. Burada Azneftin tərkibində 30 idarə əsas təsisatlar kimi təsbit olunmuşdu. İqtisadi ədəbiyyatlarda idarələr içərisində plan-iqtisad, zavod idarəçiliyi, maliyyə, texniki təbliğat, kadr hazırlığı, nəqliyyat idarələri xüsusi olaraq qeyd olunurdu. Neft emal edən müəssisələrin idarəetmə aparatında ştat vahidi 668 nəfərdən 372 nəfərə endirilmişdi (Baghirov, 1972, s. 80).

**Neft sənayesi ilə əlaqədar mütəxəssis hazırlığı və elmi-tədqiqat işlərinin təşkili**

*Mütəxəssis hazırlığı*

1920-ci il noyabrın 12-də Azərbaycan SSR-in Maarif Komissarlığı Azərbaycan İnqilab Komitəsi qarşısında Bakıda Politexnik İnstitutunun açılması barədə məsələ qaldırdı. 1920-ci ildə noyabrın 16-da N. Nərimanovun imzası ilə Politexnik İnstitutunun yaradılması haqqında dekret qəbul olundu.

Dekretdə bəyan edilirdi ki, Bakı Politexnik Uçilişinin bazasında M. Əzizbəyov adına Politexnik İnstitutu yaradılır, eyni zamanda Rus texniki cəmiyyəinin laboratoriyası yeni yaradılmış Politexnik İnstitutunun sərəncamına verilirdi. Daha sonra 1920-ci ildə Politexnik İnstitutunun Elmi Şurasının ikinci iclasında İnstitut fakültələrinin dekanları seçildi. 1) Neft sənayesi fakültəsinə dağ-mədən mühəndisi B. Dombrovski, 2) Elektromexanika fakültəsinə mühəndis-elektrik A. Sizov, 3) İnşaat-mühəndis fakültəsinə A. Şuşerov, 4) Kənd-təsərrüfatı fakültəsinə aqronom N. Lebedyev, 5) İqtisadiyyat fakültəsinə prof. N. Dubrovski dekan seçildilər. Politexnik İnstitutunun rəsmi olaraq fəaliyyətə başlaması 1921-ci il yanvarın 2-si hesab edilir (Pis'man, 1967, s. 77). Demək olar ki, 20-30-cu illər ərzində sözügedən İnstitutun tərkibində müəyyən struktur dəyişikliklər aparılmışdır. Nümunə kimi diqqəti cəlb edən aşağıdakı tarixi faktları göstərmək olar. 1921-ci ildə Politexnik İnstitutunda dörd fakültənin fəaliyyəti diqqəti cəlb edir. Bunlar aşağıdakılardır: 1) texnologiya (lektromexanika), 2) kənd təsərrüfatı, 3) inşaat-tikinti, 4) iqtisadiyyat fakültələri. Sözügedən fakültələr içərisində elektromexanika fakültəsi xüsusi olaraq diqqəti cəlb edir. Elektromexanika fakültəsinin tərkibində dağ-mədən, neft-kimya, mexanika-elektromexanika şöbələri yardılmışdı. Fakültədə həmçinin 1) çertyoj, 2) detallar, 3) geoloji, 4) materialların müqaviməti, 5) buxar qazanları, 6) istilik mühərrikləri, 7) orqanik kimya, 8) fizika, 9) analitik kimya, 10) elktromexanika laboratoriyaları və kabinetləri yaradılmışdı (Al'tyusser, 1924, s. 85).

Daha sonra diqqəti cəlb edən faktlar qismində aşağıdakılar qeyd edilə bilər. 1930-cu ildə mayın 29-da SSRİ Ümumittifaq Xalq Komissarlığının fərmanı ilə Azərbaycan Politexnik İnstitutu Ümumittifaq tabeçiliyində olan Azərbaycan Neft İnstitutuna çevrildi. 1931-ci ildə isə Qırmızı Əmək Bayrağı Ordeni ilə mükaftlandırıldı. İnstitutda aşağıdakı ixtisaslar üzrə mütəxəssislər hazırlanırdı: 1) neft-mədən ixtisası, 2) neft texnologiyası 3) geoloji-kəşfiyyat, 4) neft maşınqayırması, 5) elektrotexnika, 6) istilik, 7) mühəndis-iqtisad ixtisasları üzrə mütəxəssis hazırlığı həyata keçirilirdi. Lakin bizim diqqətimizi cəlb edən ixtisaslar içərisində mühəndis –iqtisad ixtisası xüsusi olaraq qeyd oluna bilər. Mühəndis-iqtisad ixtisası üzrə mütəxəssis hazırlığı iki istiqamət üzrə aparılırdı. Bunlar a) neft mədənləri iqtisadiyyatı, b) neftin emalı istiqamətləridir. Bütünlükdə institutda mütəxəssis hazırlığının 5-i neft sənayesi, 2-si energetika təsərrüfatı üzrə idi. Deyilənlərlə yanaşı, institutun Gəncədə, Qroznıda, Ufada, İşibayov şəhərlərində şöbələri fəaliyyət göstərirdi (Səməndərov, 2012, s. 135).

**Elmi-tədqiqat işlərinin təşkili**

1920-ci ildə "Azneft"in nəzdində "Geoloji Büro" yaradıldı. Büro demək olar ki, respublikanın bütün coğrafiyaçı alimlərini tədqiqatlara cəlb etməyə başladı. Həmin il Azneftin nəzdində Mərkəzi Kimya Laboratoriyası da yaradılmışdı (Khalilov, 1966, s. 20). Mərkəzi Kimyəvi Laboratoriyaya L.Q.Qurviç rəhbərlik edirdi. Azərbaycan neftinin kimyəvi tərkibinin araşdırılması ilə əlaqədar tədqiqatlar prof. İ.F.Qut tərəfindən həyata keçirilirdi. Bu tədqiqatların nəticələri 1926-cı ildə nəşr olunan "Azərbaycan neftinin öyrənilməsi" monoqrafiyasında öz əksini tapmışdı. Daha sonra 1929-cu ildə Azneftin nəzdində "Azərbaycan Neft Elmi Tədqiqat İnstitutu" yaradıldı. Mərkəzi Kimya Laboratoriyası yeni yaradılmış institutun tərkibinə Emal şöbəsi kimi daxil edildi. Sözügedən elmi-tədqiqat institutunun ən böyük nailiyyətləri qismində 1935-ci ildə D.P.Buxun rəhbərliyi ilə yeni demulqatorların kəşf edilməsi göstərilir («Promyshlennost' Azerbaydzhana za 40 let, 1960, s. 51-51). Daha sonra 1931-ci ilin dekabrında "Azneftin" nəzdində yaradılmış komissiya Azərbaycan Neft Elmi-Tədqiqat İnstitutunun əməkdaşlarının da cəlb edilməsi ilə ikinci 5 illikdə neft sənayesinin bərpası və inkişaf etdirilməsi planını işləyib hazırladı (Baghirov, 1972, s. 25).

XX əsrin 30-cu illərində Azərbaycanda Neft Hasilatının Təşkili Elmi Tədqiqat İnstitutunun fəaliyyəti diqqəti cəlb edir. Belə bir kontekstdə 1937-ci ildə "Azərbaycanda Neft Hasilatının Təşkili Elmi Tədqiqat İnstitutun" tərkibində yaradılmış və çox az bir müddətdə mövcud olmuş "İqtisadi araşdırmalar" şöbəsinin əməkdaşlarının apardığı araşdırmalar xüsusi ilə qeyd edilə bilər. Sözügedən elmi mərkəz sonralar, yəni 1964-cü ildə yenidən təşkil edildi (Velikaya Oktyabr'skaya revolyutsiya i razvitiye nauki v Sovetskom Azerbaydzhane, 1977, s. 305).

XX əsrin 30-cu illərində fəaliyyət göstərən daha bir elmi müəssisə kimi **"Neft Təhlükəsizliyi Elmi-Tədqiqat İnstitutu" xüsusi olaraq qeyd olunmalıdır. İnstitutun** əməkdaşları neft

sənayesində əməyin mühafizəsi və təhlükəsizlik texnikası ilə əlaqədar araşdırmalar aparırdılar (İzvestiya Azerbaydjanskoqo filiala AN SSSR, 1936, s. 33).

Qeyd etmək lazımdır ki, 1945-ci ildə Azərbaycan Elmi-Tədqiqat Neft İnstitutu Neftçıxarma və Neftayırma üzrə 2 müstəqil instituta bölündü. Daha sonra 1970-ci ildə sözügedən institut Azərbaycan Dövlət Neft Sənayesi Elmi-Tədqiqat və Layihə İnstitutu adlanırdı. Bu zaman institutda 9 elmi-tədqiqat şöbəsindən biri "neft sənayesinin iqtisadiyyatı" adlanırdı. Yuxarıda adı çəkilən elmi təsisatlar Azərbaycanda mineral xammal ehtiyatlarının tədqiqi və onlardan istifadə imkanları ilə əlaqədar araşdırmalar aparırdılar.

Daha bir diqqətəlayiq fakt kimi 1935-ci ildə SSRİ Elmlər Akademiyasının Azərbaycan filialının təsis edilməsi göstərilə bilər. Fundamental elmi araşdırmaların aparıldığı sözügedən elmi tədqiqat müəssisəsində Azərbaycan alimlərinin Neft-kimya sahəsində axtarışları böyük elmi kəşflərlə müşaiyət olundu. Nümunə kimi qeyd etmək lazımdır ki, kimyaçı alimlər *neft tullantılarından benzol alınması* üsulunu kəşf etdilər. Bu kəşfə qədər SSRİ sözügedən qiymətli məhsulu ABŞ-dən baha qiymətə satın alırdı. Azərbaycanlı alimlər *mədən sularından yod alınması* üsulunu da kəşf etdilər. Bakıda Yod zavodu inşa edildi.

**Dəyərləndirmələr**

XX əsrin 20-30-cu illərində Azərbaycan iqtisadiyyatının aparıcı sahəsi olan neft sənayesinin iqtisadi problemləri ilə əlaqədar materiallar mütəmadi olaraq dövrü və elmi mətbuatda dərc olunmaqda idi. Məqalələr əsasən "Azərbaycan neft təsərrüfatı" jurnalında dərc edilirdi. Belə bir zəmində qeyd etmək lazımdır ki, S. Kovalevskinin "Azərbaycanın neft sənayesi", A. Nikişinin Azneftin sentyabr-noyabr aylarında fəaliyyəti ilə əlaqədar təhlili materiallarında, N. Tolstonoqovun "Neft sənayesinin təsərrüfat hesabına keçməsi məsələsinə dair", "Bakı geoloqlarının qələbəsi" adlı məqalələrində, M. Lyadovun "Ticarətin inhisarlaşdırılması" məqaləsində, V. Matveyevin "Neft sənayesində əmək haqları məsələsi", F. Yakobson Kolpakovanın Bakının neft sənayesində işçi qüvvəsindən istifadə məsələləri ilə əlaqədar təhlillərində, V. Lvovun "Əmtəə və büdcə indeksi", B. Bondarevskinin "Neft sənayesinə böyük diqqət", M. Şikın "Amerikalılarla müqavilə məsələsinə dair" məqalələrində, həmçinin M. Polyakov, K. Oksyenov, N. Lebedyev, Taube, S. Konstantinov, Ram, Bondarevski, Etçin və b. məqalə və təhlili materiallarında Azərbaycanda neft sənayesinin aktual iqtisadi məsələləri ilə əlaqədar dəyərləndirmələr aparılmışdır (Səməndərov, 2010, s. 314-321).

## Nəticə

1920-ci il mayın 7-dən neft sənayesinin sovet dövrü başlanır. Neft sənayesində mövcud situasiya kolonialist situasiya kimi xarakterizə edilir. Ümumiyyətlə, neft və neft məhsulları SSRİ-nin ixrac məhsulları içərisində mühüm və strateji məhsullardan biri idi və Azərbaycan neft sənayesinin məhsulları burada mühüm yer tutmaqda idi. Məhz bu baxımdan həyata keçirilən iqtisadi siyasətdə başlıca istiqamətlər kimi neft sənayesinin inkişaf etdirilməsi, sözügedən sahə üçün mütəxəssis hazırlığı və elmi-tədqiqat işlərinin təşkili məsələləri xüsusi yer tuturdu.

## Ədəbiyyat

1. *Azərbaycan SSR Xalq Təsərrüfatı Statistika külliyyatı*. (1957). Dövlət Statnəşr.
2. İsmayılov, İ. Z. (2007). *Azərbaycan nefti XX əsrdə (hərbi-siyasi baxış)*. Azərbaycan Dövlət Neft Akademiyası.
3. Nəriman, N. (1992). Ucqarlarda inqilabımızın tarixinə dair (İ.V.Stalinə məktub). Azərbaycan Dövlət Nəşriyyat Poliqrafiya Birliyi.
4. Səməndərov, S. S. (2010). XX əsrin 20-ci illərin də Azərbaycanda neft sənayesinin iqtisadi məsələlərinin elmi ədəbiyyatlarda əks olunması. *Azərbaycan Milli Elmlər Akademiyası İqtisadiyyat İnstitunun Elmi Əsərləri*, 4, 314-321.
5. Səməndərov, S. S. (2012). *XX əsrin 20-30-cu illərində Azərbaycanda elmi-tədqiqat, təhsil, təlim və informasiya mərkəzlərinin təşəkkülü*. Avropa Nəşriyyatı.
6. Al'tyusser, S. A. (1924). (Sostavil). *Ves' Azerbaydzhan (Adres i spravochnik)*.
7. Baghirov, M. (1972). *Iz istorii razvitiya promyshlennosti Azerbaydzhana (1933-1937)*. Azeneshr.
8. Izvestiya AN Azerbaydzhanskoy SSR. (1967). *Seriya "Ekonomika"*, 3-4.

9. *Izvestiya Azerbaydzhanskogo filiala Akademii nauk SSSR*. (1938). № 1, № 3.
10. *Izvestiya Obshchestva izucheniya i issledovaniya Azerbaydzhana*. (1925). № 1, 141.
11. Khalilov. (1966). *Akademiya nauk Azerbaydzhanskoy SSR na protyazhenii 20 let*.
12. Pis'man, A. (1967). Kommunisticheskaya partiya Azerbaydzhana v bor'be za sozdaniye kadrov dlya narodnogo khozyaystva respubliki v gody stroitel'stva ekonomicheskoy bazy sotsializma (1920-1930 gg.). *Uchenyye zapiski Azerbaydzhanskogo instituta narodnogo khozyaystva*, 3(2), 71-79.
13. *Promyshlennost' Azerbaydzhana za 40 let* (1920-1960). (1960). Azeraneshr.
14. Smelov, A. A. (1966). *Deyatel'nost' khozyaystvennykh organov sotsialisticheskogo gosudarstva posle vosstanovleniya narodnogo khozyaystva (1921-1925 gg.) na primere Soveta Narodnykh Komissarov Azerbaydzhanskoy SSR: Avtoreferat dissertatsii na soiskaniye uchenoy stepeni kandidata ekonomicheskikh nauk*.
15. Serikova, U. S., & Zul'fugarova, N. I. (2013). Istoriya stanovleniya i osnovnyye etapy razvitiya neftegazovoy promyshlennosti Prikaspiyskogo regiona, *Istoriya i pedagogika yestestvoznaniya*, 2, 15-21.
16. Tokarzhevskiy, E. A. (1949). Nachalos' vosstanovleniye neftyanoy promyshlennosti v Azerbaydzhane (1921-1922). *Sbornik statey po istorii Azerbaydzhana*. 1, 340-351.
17. Velikaya Oktyabr'skaya revolyutsiya i razvitiye nauki v Sovetskom Azerbaydzhane. (1977). Nauka.

Daxil oldu: 09.10.2024
Baxışa göndərildi: 30.11.2024
Təsdiq edildi: 01.01.2025
Çap olundu: 22.02.2025

https://doi.org/10.36719/2663-4619/111/15-20

**Sevara Usmanova**
Fergana State University
Ph. D., Associate Professor
https://orcid.org/0000-0002-8663-6039
mahkamovasevara078@gmail.com

# The Personality of the Princess and the Author's Attitude in Historical Novels

**Abstract**

This article discusses how historical novels often portray queens as powerful and influential figures who wield power and navigate the complexities of court life. These novels provide a window into the political intrigue, power struggles, and personal sacrifices that have characterized the lives of queens throughout history. From the grandeur of royal palaces to the challenges of leadership, historical novels portray queens as embracing the nuances of power, duty, and personal relationships.

***Keywords:*** *Uzbek literature, image of a princess, Uzbek and English folk art, historical novel*

**Sevarə Usmanova**
Fərqanə Dövlət Universiteti
fəlsəfə doktoru
https://orcid.org/0000-0002-8663-6039
mahkamovasevara078@gmail.com

## Tarixi romanlarda şahzadələrin şəxsiyyəti və müəllif mövqeyi

**Xülasə**

Bu məqalədə tarixi romanlarda kraliçaları hakimiyyətə sahib olan və saray həyatının mürəkkəbliklərini idarə edən güclü və nüfuzlu şəxsiyyətlər kimi necə təsvir edildiyi müzakirə edilir. Bu romanlar tarix boyu kraliçaların həyatını səciyyələndirən siyasi intriqalara, hakimiyyət mübarizələrinə və şəxsi fədakarlıqlara bir pəncərə təqdim edir. Kral saraylarının əzəmətindən tutmuş liderliyin çağırışlarına qədər tarixi romanlar kraliçaları güc, vəzifə və şəxsi münasibətlərin nüanslarını əhatə edən kimi təsvir edir.

***Açar sözlər:*** *Özbək ədəbiyyatı, şahzadə obrazı, özbək və ingilis xalq yaradıcılığı, tarixi roman*

## Introduction

The historical novel is an integration point between science and art (Belinsky, 1955), is created based on facts, considering that one of the main issues is the correspondence of socio-political problems and events covered in past works, and the historical reality of the heroes of the work. After all, the author of a historical work, based on his imagination and fantasy, turns to the artistic texture, that is, the woven plot, woven images and events. In this way, the truth of the past is revealed with accuracy. It requires caution from the creator who has touched upon a historical work when turning to the artistic texture. We should not confuse the artistic texture with fiction and error. For example, in one of R. Khaydarova's articles, what is historical truth? artistic texture? fiction? clarifies questions such as: "Some time ago, one of the historical novels that came to the Prose Council of the Writers' Union of Uzbekistan was submitted to me for review. The novel "I am the Emir of Movarunnahr" by an amateur writer describes the period of Amir Temur from his childhood to his entry into politics. Those who read the review said, "Is this so significant?" about some of the episodes in the "work" that I objected to. Draw your own conclusions: Amir Temur (as it is written in the novel, Temurbek) remembers his deceased mother and says (the novel is narrated in the first person – Amir Temur's language): "How kind my mother was, she would make tea for me in a samovar…" Next clip:

Temurbek's sister Kutlug' Turkon is being played. Haydarova (2017) writes: "After the mullah finished reading the "Marriage" surah, he said, "I declare you husband and wife". Indeed, the writer has the right to artistic texture. However, the presence of such "historical errors" in the work causes the reader to lose faith in history and become hesitant. The main criterion in historical novels is historical reality and imagery. This is the most important aspect that ensures the artistic quality of the work.

**Research**

A plot is a set of interconnected events that reveal the main content of a work of art and the character of its characters (Uzbek language explanatory dictionary, 2024). A plot is the fruit of the author's imagination. If the writer proves his character and the events of the work with the logic of the world of fiction, then it becomes a plot. In the historical novel Bibikhanim by Shahodat Isakhanova, a representative of this family, who caused a lot of damage to the Timurid empire, Shodmulk, the wife of Khalil Sultan, was a woman with vile intentions. "Let this priceless gem of the mortal world be a worthy gift from us two to our prince," she says. Abu Bakr, not knowing what to do, asks the concubine for advice. If Shodmulk agrees, he wants to go with the girl to the farthest place. The concubine becomes interested in him as soon as she hears the prince's story. "Being a concubine to the prince will bring happiness to both of us", she agrees to become a concubine to the prince… In this work, Shakhodat Isakhanova influenced the historical truth about the letters of other heroes in the work in the artistic texture related to the image of Shodmulk. In general, when writing a historical work, the writer should not contradict the facts presented in historical sources. Otherwise, their true image in the public imagination may be overshadowed. It is impossible for any creator not to resort to artistic texture when creating a historical work. But the texture must be distinguished from fiction. By analyzing the following passage from Salokhiddin Toshkandiy's "Temurnoma", we can understand to what extent the work is based on historical facts or its opposite (Axmedov, 1994).

We all know that Saraymulkhanim Sahibkiran was the beloved wife of Amir Temur and played an important role in the socio-political life of the country. Salahiddin Tashkenti's work "Temurnama" tells the story of how Amir Temur met Saraymulkkhanim: "One night in a dream (Bayonqulikhan) he saw Shaikh ul-a'lam. They said: do not violate the Sharia, get up, give your daughters in marriage. Bayonqulikhan had nine daughters. He got up from his sleep and gathered all his daughters... The youngest of them was Saray Mulkkhanim, she said, "O father, I will not go anywhere under the shadow of your state, and I will not accept a husband", One day the king saw Shaikh ul-a'lam in a dream again. This respected person asked the king to marry Saraymulkkhanim. The next day, the khan invites his daughter to his presence. The girl says, "If you will consider my wishes?! Give me to Taragay Bahadur oglu (Amir Temur)". However, due to the cooling of relations between Shahrisabz Beg Taragay Bahadur and the khan, Bayonquli Khan does not consent to this marriage.

Although Saraymulkkhan is indicated in the "Temurnama" as the daughter of Bayonquli Khan, in fact, historical sources indicate that she was the daughter of Kazan Khan, the ruler of Transoxiana, who was one of the Genghisids. In terms of following the chronology of historical events, the role of chronology in fairly assessing events and historical figures is incomparable. In adhering to the order of events in a work of art, there is a certain relativity in its content (Ziyo, 2000).

When Bayankulikhan refused to give his daughter to Amir Temur for a cheap price, the princess told her father, "Whoever wins a game of chess with me, I will be the wife of the winner, even if he is a shepherd". The khan agreed to the competition. The princess came to the chess competition dressed as a slave boy; "Tell me, my lady; I will be your slave. Tell me, who will challenge us to play chess with our slave, and whoever wins, I will give him my slave. The khan then accepted his daughter's word and said, "Okay". It is known that in ancient times, Eastern women were not inferior to them in terms of modesty and modesty. In the work, the author describes the image of Saraymulkkhanim in a way that goes far beyond the oriental ideal. Turan women were not afraid to set conditions for their fathers when marrying, let alone look them straight in the eye. However, in Khurshid Davron's "The Story of Bibikhanim", we see a different interpretation of this historical event". When Saraymulkkhanim turned sixteen, the khan began to look for a suitable groom for her daughter. For this purpose, he sent messengers to forty-one countries and invited princes to the court.

But the princes who came did not like one of them, and he did not like the other, and he rejected all of them with disappointment.

One day, the young man Temurbek, famous for his courage and wisdom, entered his palace. The khan was overjoyed by this visit. He dressed his daughter in royal clothes worth the cost of a city's tax, and presented her with jewelry worth the cost of a province's tax, and brought her to Temurbek. Temurbek shook his head as if to say "no" to the girl.

The wise girl, who understood the meaning of these words, raised her head and looked at Temurbek for the first time. A conversation between the two eyes began. The girl's eyes said: "I fell in love with this young man at first sight. Wherever he goes, I will go with him. Whoever he loves, I will love, whoever he hates, I will hate. If he grieves, I will grieve, if he laughs, I will laugh. If he protects me with his sword, I will protect him with my love ." The young man's eyes said: "You are as charming as a desert flower, my beauty. Like a flower petal washed by spring rains, there is not a single stain on your face, I will make the sound of the silver rings on your feet resonate with the song of my heart, my beauty. I will turn the embers flickering in the depths of your eyes into fire, my beauty. "I'll take you on my falcon, my dear".

Speaking of Saraymulkkhanim, historical sources record that she joined the harem of Sahibkiran Timur after the defeat of Amir Husayn. Khurshid Davron described Saraymulkkhanim as a 16-year-old virgin who had just reached puberty. In fact, Saraymulkkhanim was married to Amir Husayn, the grandson of the ruler of Movarounnahr, Amir Qazaqan, in 1355. In 1370, Sahibkiran Amir Timur defeated Amir Husayn in battle and had him executed, and took over the rule of Movarounnahr. Naturally, Amir Husayn had several wives, and the great mistress of the harem was Suyunch Kutlug Aga, the daughter of Tarmashirin Khan. Sahibkiran Amir Temur chose Sarai Mulk Khanum, the daughter of Kazan Khan, Ulus Agha, the daughter of Bayan Sulduz, Islam Agha, the daughter of Khizr Yasuri, and Tagoy Turkon Khotun from among the princesses in the harem of the deceased, and married them after a waiting period of three months. In the above-mentioned conversation, the writer was able to fully reveal the shyness and thoughtfulness of Bibi Khanum, typical of true Eastern women. However, Sahibkiran's psychological portrait was somewhat romantic, depicting her as a young man in love. It would have been closer to the truth if Amir Temur had been depicted as a serious, thoughtful, quiet person who kept a secret from people.

“Kazan Khan preferred to go hunting on horseback or attack the enemy with a sword rather than sitting in a palace and having a feast. However, from the day his beloved wife gave birth to a daughter, he abandoned these habits and preferred to spend time with his daughter day and night, and he named his child Saraymulkkhanim, hoping that in the future his daughter would become the property of a palace. Time flew by like an arrow shot at a tiger by Kazan Khan when he was a young man, and Saraymulkkhanim turned sixteen”. According to the information cited by the historian Turgun Fayziev in the sources, Kazan Khan died when Saraymulkkhanim was 5 years old. So, the only event of the meeting of Saraymulkkhanim and Amir Temur in life fulfills different functions in different interpretations in the works. In the above works, relativity is seen from different angles. This serves a certain purpose. When any writer sits down to write a historical work, he becomes deeply immersed in the artistic texture. Of course, this is because his feelings for creativity become so boundless. But we must not forget that a historical work is a very delicate matter, the future generation will understand history through literature and art. Therefore, when a writer turns to a historical novel, he should stay away from chronological relativity.

**It is known that the historical novel is important in preserving and conveying knowledge about the past. However, when creating works of art based on historical events, writers face the problem of maintaining a balance between historical truth and artistic texture. Historical truth requires accuracy and reliability, while artistic structure seeks to provide expressiveness and aesthetic impact on the reader. In our study, we will consider how writers study historical events, sources, and facts to create a reliable historical basis for their works, and what compromises they must make to achieve artistic integrity (**Light, 1989**).**

Queens have always held a fascinating place in English literature, and historical novels provide a fascinating lens through which to explore their lives, challenges, and legacies. The portrayal of

queens in historical novels is a rich and multifaceted subject that provides valuable insights into the portrayal of female monarchs across different eras, cultures, and literary genres. From ancient rulers to medieval monarchs and beyond, historical novels present a diverse and complex portrayal of queens, shedding light on their role as leaders, mothers, and influential figures in shaping the course of history (Rui Gonzalez de Clavijo, 2010).

Historical novels often portray queens as powerful and influential figures who wield power and manage the complexities of court life. These novels provide a mirror to the political intrigue, power struggles, and personal sacrifices that have characterized the lives of queens throughout history. From the grandeur of royal courts to the challenges of leadership, historical novels portray queens as embracing the nuances of power, duty, and personal relationships. Nancy Goldstone's Four Queens explores the political and emotional dimensions of their lives as queens in historical novels *"The messengers had long since brought news of Louis's death - but only now did the Queen Mother learn of the true scale of the losses caused by the crusade: her husband, son, daughter, son-in-law and daughter-in-law, and long-awaited grandson, and brother-in-law, and his wife - all were dead"* (Goldstone, 2010).

These novels often explore the inner lives of queens, depicting the impact of their struggles, triumphs and decisions on their families and subjects. Through the lens of historical fiction, readers gain a deeper understanding of the human complexities behind the royal facade, revealing the vulnerabilities, ambitions and personal relationships that shaped the lives of the queens.

The portrayal of queens in historical novels also reflects the broader social and cultural contexts in which these royal figures lived. The historical novel provides a platform for examining the social norms, gender expectations, and power dynamics that shaped the lives of queens and shaped their public image. By examining the portrayal of queens in historical novels, readers gain insight into how these royal figures transcended the limitations of their time and left a lasting mark on the course of history. Author Alison Weyer's "Queen of England-Wolf of France: Isabella" (11) explores the thematic explorations of the queen, as well as changing attitudes toward female leadership and authority. Throughout history, queens have faced unique challenges and limitations due to their gender, and historical fiction provides a lens through which to examine the ways in which these challenges are depicted and interpreted in literature. From succession struggles to the complexities of ruling in a male-dominated world, historical novels illuminate the resilience, intelligence, and determination of the queens who have taken their place in history.

The portrayal of Catherine in the work often reflects evolving perspectives on gender, power, and leadership. These representations provide an opportunity to explore society's changing attitudes toward female authority and the ways in which queens negotiated their roles within the constraints of their societies. Thus, the historical novel becomes a platform for exploring the complexities of female leadership and allows for an analysis of the challenges and triumphs of queens as they navigate the nuances of power and influence.

Thematic explorations of queens in historical novels also allow readers to consider the enduring legacy of these royal figures and their impact on history (Gregory, 2006). By exploring the nuanced portrayal of Queen Catherine of Aragon in Philippa Gregory's The Eternal Queen, readers gain a deeper understanding of the complexities of their lives, the enduring appeal of their stories, and the imprint they leave on cultural narratives. Through this work, the portrayal of queens demonstrates the timeless relevance of their stories and legacies. Whether exploring the lives of ancient rulers, medieval monarchs, or Renaissance queens, historical novels provide a platform for engaging with the timeless themes of strength, ambition, and resilience that have characterized the lives of queens throughout history. The enduring appeal of queens is evidence of the universal significance of their stories, which continue to inspire, engage, and provide valuable insights into the complexities of women's leadership and influence.

English literary scholar Lisa Hopkins analyses the writings of and about Queen Elizabeth I of England and Mary, Queen of Scots, and places them in the context of Renaissance literature. In her study, Hopkins examines the writings of and about female rulers of the Renaissance (Weir, 2012). She provides a detailed analysis of the poems, letters, and other writings written by Elizabeth I and

Mary, Queen of Scots, and places them firmly in the context of other literary representations of queens and queens of the Renaissance. Lisa Hopkins examines a range of texts, from Shakespeare to Milton to Elizabeth Carey. It is well known that the portrayal of queens in historical novels represents a rich and multifaceted subject that offers valuable insights into the portrayal of female monarchs across different historical periods, cultures, and literary genres. Through critical analysis and cited scholarly works, readers are invited to engage in a fascinating exploration of the diverse depictions of kingdoms in historical fiction, and to gain a deeper understanding of their roles, problems, and enduring influence on literature and culture (Khamdamova, 2012).

## Conclusion

Historical novels provide a compelling lens through which to study the portrayal of queens, giving readers a glimpse into the lives, struggles, and triumphs of these remarkable female figures. Through the narratives woven into historical fiction, the image of queens is imbued with complexity, depth, and resonance, providing a nuanced understanding of their roles as leaders, mothers, and influential figures in shaping the course of history. From the grandeur of royal palaces to the turbulent political landscapes they navigated, historical novels richly explore the multifaceted nature of queenship and the enduring influence these royal figures have on literature and culture. At first sight, the story of Elizabeth's treatment of Lady Catherine can certainly be read as simple vindictiveness, and it has, indeed, often been both read and written as little more than sour grapes a woman who had not married showing herself bitterly resentful of one who had. Certain other aspects of the incident, however, prompt a reassessment of such a position. In the first place, there was at that point of the reign no reason to suppose that Elizabeth herself would not marry one day, if she chose; in the second, Lady Catherine was her cousin, and so dangerously close to the succession-as the adventures of her elder sister Lady Jane had all too obviously demonstrated. For her to marry with-out permission was thus a political, rather than a personal, offense, and, one might feel, an act of the highest folly on her part. Moreover, the wedding had been solemnized in such strict secrecy that no actual proof of it could be found; the only witness, Hertford's sister Lady Jane Seymour, had died, also of consumption, and the officiating minister was never traced (Bamberi, 1990).

The union was thus technically illegal, and, in a worst case scenario, had introduced the taint of bastardy into the descent of Elizabeth's heir-apparent. Elizabeth need not have been unduly concerned about this- she had, after all, been branded a bastard herself by her own father; but she also knew that it was precisely because of her own alleged bastardy that Mary Queen of Scots could be put forward as an alternative candidate for her throne. So, from the above, L. Hopkins (2002) suggests that the depiction of queens serves as a reflection of the broader socio-cultural dynamics of their time, shedding light on the gender expectations, power dynamics, and social constraints that shaped the lives of queens throughout history. Historical fiction, then, provides a platform for exploring the complexities of female leadership, allowing readers to engage with the struggles and triumphs of queens as they navigate the nuances of power and influence in their societies. The enduring fascination with the lives and legacies of queens also underscores the timeless appeal of their stories and the enduring relevance of their impact on cultural narratives. Through the fictional verisimilitude of historical novels, readers are transported to different historical periods, allowing them to witness the struggles, triumphs, and personal sacrifices of queens within the context of their societies. Whether the complexities of medieval courts, the intrigues of Renaissance Europe, or the challenges of colonial expansion, historical novels provide compelling explorations of the diverse experiences of queens across time and space (Hopkins, 2002).

## References

1. Axmedov, A. (1994). *Ulug'bek Muhammad Tarag'ay*. Xalq merosi.
2. Bamberi, H. (1990). *Buxoro yohud Movarounnaxr tarixi*.
3. Belinsky, V. G. (1956). *Selected philosophical works.*
4. Goldstone, N. (2010). *Four Queens: The Provencal Sisters who Ruled Europe*. Hachette UK.
5. Gregory, P. (2006). *The constant princess* (Vol. 6). Simon and Schuster.

6. Hopkins, L. (2002). *Writing Renaissance Queens: Texts by and about Elizabeth I and Mary, Queen of Scots.* University of Delaware Press.
7. Khamdamova, M. (2012). *The historical ambassador Nizamshah*. New edition.
8. Light, A. (1989). Young Bess: Historical Novels and Growing Up. *Feminist Review*, 33(1), 57-71.
9. Rui Gonzalez de Clavijo. (2010). *Diary of a trip to the palace of Amir Temur in Samarkand* (1403-1406).
10. *Uzbek language explanatory dictionary*. (2024).
11. Weir, A. (2012). *Isabella: she-wolf of France, Queen of England*. Random House.
12. Ziyo, A. (2000). *History of Uzbek statehood: From ancient times to the Russian invasion.* Sharg.

Received: 26.10.2024
Revised: 04.12.2024
Accepted: 24.01.2025
Published: 22.02.2025

https://doi.org/10.36719/2663-4619/111/21-26

**Nailə İbrahimova**
Bakı Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0004-2992-9099
UOT 81.111
ibrahimovanaila13@gmail.com

# Quruluşuna görə cümlə üzvlərinin xüsusiyyətləri

## Xülasə

**Tədqiqatın məqsədi.** Cümlə müəyyən qrammatik qaydalara uyğun olaraq söz və ya ifadələrdən ibarət olan və bitmiş məna ifadə edə bilən dil vahididir. Cümlə məna kəsb etmək, hərəkəti və ya vəziyyəti ifadə etmək üçün məntiqi ardıcıllıqla yerləşdirilmiş sözlər toplusundan ibarətdir. Cümlə üzvləri cümlənin struktur elementləridir. Onlar bir cümlədə birləşir və müəyyən funksiyaları yerinə yetirirlər. Cümlə üzvləri bir və ya bir neçə sözdən ibarət ola bilər və yalnız cümlə daxilində bütövlükdə köçürülə bilər.

Quruluşuna görə cümlə üzvlərinin xüsusiyyətlərinin araşdırılması dilçiliyin inkişafı baxımından mühüm əhəmiyyət kəsb edir. Bu tədqiqatın məqsədi cümlə üzvlərinin quruluşunun öyrənilməsi, qrammatik əlaqələrin müəyyən edilməsi və cümlə üzvlərinin funksional əhəmiyyətinin təhlil edilməsidir. Quruluşuna görə cümlələr əsasən sadə və ya mürəkkəb cümlə olmaqla iki hissəyə bölünür. Sadə cümlə bir feildən ibarət olan cümlələrdir. Sadə cümlədən fərqli olaraq mürəkkəb cümlə bir və ya bir neçə cümlədən ibarət olur.

**Tədqiqat metodu.** Bu tədqiqatın araşdırılması zamanı analitik metod, eksperimental metod, tətbiqi metoddan istifadə edilmişdir. Tədqiqatda işlədilən sintaktik təhlil cümlələrin quruluşu müəyyən edilir, morfoloji təhlil cümləni ethiva olan sözlərin morfoloji xüsusiyyətləri araşdırır.

**Tədqiqatın nəticələri.** Tədqiqatın əsas nəticələri cümlə üzvlərinin ümumi xarakteristikasının, cümlə üzvlərinin quruluşunun və nitq hissələrinə görə xüsusiyyətlərinin araşdırılması baxımdan əhəmiyyət kəsb edir. Cümlə üzvlərinin quruluşuna görə araşdırılmasının nəticələri dilçilik və üslubiyyat baxımından önəmlidir.

***Açar sözlər:*** *cümlə, cümlə üzvləri, sadə cümlələr, cümlənin quruluşu, mürəkkəb cümlələr, ardıcıl cümlə*

**Naila Ibrahimova**
Baku State University
PhD in Philology
https://orcid.org/0009-0004-2992-9099
UOT 81.111
ibrahimovanaila13@gmail.com

# Characteristics of Sentence Members According to Their Structure

## Abstract

**Purpose of the study.** A sentence is a language unit consisting of words or phrases in accordance with certain grammatical rules and capable of expressing a complete meaning. A sentence consists of a set of words placed in a logical sequence to acquire meaning, express an action or state. Sentence members are structural elements of a sentence. They are combined in a sentence and perform certain functions. Sentence members can consist of one or more words and can only be transferred as a whole within a sentence.

The study of the characteristics of sentence members according to their structure is of great importance in terms of the development of linguistics. The purpose of this study is to study the

https://doi.org/10.36719/2663-4619/111/100-103

**Tahir İsmayılov**
Heydər Əliyev adına Hərbi İnstitut
https://orcid.org/0009-0006-9780-8381
tahir.6591@gmail.com
**Aygün Rəsulova**
Heydər Əliyev adına Hərbi İnstitut
https://orcid.org/0009-0001-9841-6359
hasanova.aygun11@gmail.com

# Fizikadan yoxlama işlərinin xüsusiyyətləri və onların nəticələrinin analizinin işlənib hazırlanması

**Xülasə**

Fizikanın tədris metodikasının müasir tələblərə uyğunlaşdırılması istiqamətində müxtəlif müəlliflər və ya müəlliflər heyəti tərəfindən müxtəlif metodik vasitələr mövcuddur. Müasir təhsil proqramlarında müxtəlif inovativ üsulların, texniki və texnoloji vasitələrin tətbiq olunmasına baxmayaraq öyrədilmə və öyrənmə prosesi daim inkişafdadır. Hər hansı məlumatın öyrəniciyə çatdırılması və öyrənici tərəfindən mənimsənilməsi üçün müəllim tərəfindən tətbiq edilən metodikanın xüsusi rolu danılmazdır. Konkret olaraq hər bir mövzunun öyrənilməsi fərqli metodik yaxınlaşma tələb etdiyindən, konseptual elmi yaxınlaşmanı saxlamaqla keyfiyyətcə dərslərin məzmununun yeniləşdirilməsi mühüm amillərdəndir.

Təqdim olunan məqalə fizikadan yoxlama işlərinin məzmunu və onların analizlərinin işlənib hazırlanması problemlərinə həsr edilmişdir. Məqalədə yoxlama işlərinin strukturunun seçilməsi, çalışmaların yerinə yetirilməsinin analizinin istiqamətləri və fizikanın tədrisi metodikasının təkmilləşdirilməsində əsas yanaşmalara baxılmışdır.

Fizikadan yoxlama işlərinin keçirilməsi qiymətləndirmə meyarları sisteminin mühüm inkişaf istiqamətini müəyyən edir. Hər bir mövzunun sonunda keçirilən yoxlama işləri öyrənicinin fərdi biliklərinin qiymətləndirməsinə yönəlir. Yoxlama işlərinin daxil edilməsi tədris edilən fənnin öyrənici tərəfindən necə mənimsənildiyini müəyyən etmək məqsədi daşıyır.

***Açar sözlər:*** *yoxlama işi, baza, qrup, təcrübə, ölçmə, metodologiya, fiziki kəmiyyət*

**Tahir Ismayilov**
Military Institute named after Heydar Aliyev
https://orcid.org/0009-0006-9780-8381
tahir.6591@gmail.com
**Aygun Rasulova**
Military Institute named after Heydar Aliyev
https://orcid.org/0009-0001-9841-6359
hasanova.aygun11@gmail.com

# Development and Preparation of the Characteristics of Physics Test Work and Analysis of Their Results

**Abstract**

There are various methodological tools by various authors or groups of authors in order to adapt the teaching methodology of physics to modern requirements. Despite the application of various innovative methods, technical and technological tools in modern educational programs, the teaching and learning process is constantly evolving. The special role of the methodology applied by the teacher for the delivery of any information to the learner and its assimilation by the learner is undeniable. Since the study of each topic requires a different methodological approach, qualitatively

updating the content of lessons while maintaining a conceptual scientific approach is one of the important factors.

The presented article is devoted to the problems of developing the content of physics test papers and their analysis. The article considers the selection of the structure of test papers, the directions of analysis of the performance of the exercises, and the main approaches to improving the teaching methodology of physics.

Conducting test papers in physics determines an important direction of development of the assessment criteria system. Test papers conducted at the end of each topic are aimed at assessing the individual knowledge of the learner. The inclusion of test cases aims to determine how the subject being taught is mastered by the learner.

***Keywords:*** *test case, base, group, experiment, measurement, methodology, physical quantity*

## Giriş

Məlum olduğu kimi, yekun yoxlama işi hər hansı bölmənin tədrisi başa çatdıqdan sonra keçrilir, belə yoxlama işləri işçi proqramın məzmunundan asılı olaraq 3 (üç) və ya 4 (dörd) ola bilər. Fizikadan yoxlama işləri fizika tədris olunan qruplarda bütün öyrənicilər üçün eyni yanaşma bazasına əsaslanmalıdır.

Yoxlama işinin yerinə yetirilməsi baza biliklərinin yoxlanılması və çətinlik dərəcəsi yüksək olan mürəkkəb məsələlərin həlli də daxil olmaqla 80 (səksən) dəqiqəyə hesablanmalıdır. Əgər yoxlama işi açıq və qapalı sualların qarışığından ibarətdirsə, onda açıq tipli sualların qiymətləndirilməsi ümumi qiymət balının 25 % (iyirmi beş faizini) təşkil etməlidir. Yoxlama işlərinə daxil edilən sualların və çalışmaların sayı (açıq və qapalı) keçilən bölmənin həcmindən, çətinlik dərəcəsindən və başqa faktorlardan asılı ola bilər. Yoxlama işində bölmənin həmin bölməyə aid baza elementlərinin mənimsənilmə dərəcəsi qiymətləndirilir. Təqdim olunan məqalədə fizikadan yekun yoxlama işlərinin hansı tələblərə cavab verməli olduğu və yoxlama işlərinin analizinin nəticələri verilmişdir (Qocayev, Əliyev, 2011).

### Tədqiqat

Yoxlama işlərinin məzmunu baza elementlərinin seçilib tərtib olunmasında mühüm mərhələ olmaqla, öyrənici anlayış və fizik qanunları bilmək, fiziki hadisələri fiziki qanunlar əsasında izah etmək, qanunları necə tətbiq edə bilmək bacarığını aşkar etmək baxımından diqqət mərkəzində olmalıdır (Osmanov, Paşayev, 2021).

Ölçmə materiallarının seçilməsində aşağıdakı iki əsas istiqamətə diqqət yetirilməlidir:

- fizika kursunun yönəlmiş olduğu metodoloji bacarıqların gücləndirilməsi;
- praktik tapşırıqların istifadə edilməsinə yönələn konteksdə məsələlərin seçilməsi.

Yoxlama işlərinin məzmunu zəruri olaraq öyrənicinin fizikadan bilməli olduğu əsas tələblər qrupunu əhatə etməlidir (Əhmədov, 2008).

Dörd növ bacarığı özündə ehtiva edən dörd tapşırıq qrupunu qeyd etmək olar:

- hadisə və prosesləri təsvir və izah etmək fiziki kəmiyyət və qanunları tətbiq etmək;
- birbaşa ölçmələr aparmaq və təcrübənin keçirilmə ardcıllığını planlaşdırmaq;
- alınmış biliklərin müxtəlif qurğuların təsvir edilməsi və müxtəlif texniki obyektlərin iş prinsipinə tətbiq edilməsi;
- tədris-praktik məsələlərin həllində mətn və qrafik şəkildə verilmiş informasiyaları istifadə etmək.

Birinci qrup tapşırıqlarda fiziki anlayışları qruplaşdırmaq; müyyən fiziki kəmiyyətləri təyin etmək; şərh edilən fiziki hadisəni tanımaq və təsvir edilən fiziki hadisənin əsas xüsusiyyətlərini seçə bilmək; müxtəlif proseslərdə fiziki kəmiyyətlərin dəyişməsini analiz edə bilmək; fiziki modellərlə işləyə bilmək; hadisə və prosesləri fiziki qanunlar vasitəsilə izah edə bilmək; şərh olunan prosesdə prosesi xarakterizə edən fiziki kəmiyyətlər arasında asılılıq qrafiki qura bilmək; fiziki kəmiyyətləri hesablamaq üçün qanun və düsturlardan istifadə etmək bacarığı yoxlanılır (Zülfüqarov, Qasımov və Qasımova, 2018).

İkinci qrup tapşırıqlarda ölçü cihazlarından, ölçmələrin verilmiş xətalarının nəzərə alınaraq, ölçmələrin götürülməsi; təcrübələrin qrafik və ya cədvəl şəklində verilmiş nəticələrini analiz edə

bilmək; tədqiqatı sərbəst şəkildə planlaşdıra bilmək kimi metodoloji bacarıqların formalaşması yoxlanılır.

Üçüncü qrup tapşırıqlarda alınmış biliklərin müxtəlif texniki obyektlərin quruluşunu və iş prinsipini təsvir etmək bacarığı yoxlanılır. Burada həm verilmiş texniki qurğunun iş prinsipinin əsasında duran fiziki hadisəni təyin etmək üçün tapşırıqlar, həm də qurğunun əsas xarakteristikalarını başa dümək və onlardan təhlükəsiz istifadə etmək qaydalarını bilmək bacarığını aşkara çıxaran tapşırıqlardan istifadə edilir.

Axırıncı qrup tapşırıqlarda fiziki məzmuna malik informasiya mətnlərindən istifadə edə bilmək bacarığı yoxlanılır: buraya mətndə aşkar şəkildə verilmiş informasiyanın başa düşülərək seçilməsindən tutmuş, mətndəki informasiyadan və əldə edilmiş biliklərdən istifadə edilməsini nəzərdə tutan tapşırıqlar daxildir.

Çox vaxt yoxlama işlərində verilən sualı cavablandırmaq üçün lazım olan informasiyanın müəyyən hissəsinin tapşırığın mətnində yer aldığı kontekst tapşırıqlardan geniş istifadə edilir (Yalçın, 2012).

Əsas isə həyati xarakterə malik situasiya üzərində qurulmuş tapşırıq modellərinin yaradılması istiqamətidir.

Fizikadan yoxlama işlərinin nəticələrinin analiz olunması − təhsil müəsisələrində verilən təhsilin keyfiyyətinin daxili qiymətləndirilməsin mühüm hissəsidir. Belə analizlərin aparılması fənnin tədrisində olan çatışmamazlıqların aşkar olunaraq, gələcəkdə aradan qaldırılmasına xidmət edə bilər. Digər tərəfdən gələn tədris ilində öyrənicilərlə tədiris zamanı tədris metodikasına lazım ola biləcək dəyişikliklərin planlaşdırılması da belə analizin nəticələrindən çox asılıdır (İsmayılov, 2001). Yoxlama işlərinin nəticələrinin analizinin aşağıdakı tipik bloklardan qura bilərik: qiymətləndirmənin həyata keçirilməsi; qiymətlərin orta statistik nəticələri və orta bal; öyrənicələrin yığdıqları ballara görə paylanma diaqramı; müxtəlif səviyyəli öyrənicilərin yerinə yetirilmiş yoxlama işlərinin analizi; nəticələr və tədris prosesinin yaxşılaşdırılması üçün verilən tövsiyələr (Rəsulova, İsmayılov, 2022).

İstənilən tədris müəsisəsində qəbul olunmuş ümumi analizin nəticələri göstərir ki, öyrənicilərin 16-17 %-i fizikiadan standart baza hazırlıq səviyyəsini keçə bilmirlər. Standart baza səviyyəli çətinliklərə malik tapşırıqları yerinə yetirə bilən öyrənicilər isə orta hesabla 73,4 % təşkil edir. Analiz nəticəsində məlum olur ki, bacarıq və məzmun elementlərinin mənimsənilməsində öyrənicilər daha çox çətinlik çəkirlər. Fikrimizcə, müasir texnologiyaların tətbiqi tədris prosesinə müsbət təsir gösərməklə, öyrənicilərin şifahi və yazılı nitqinin ləngiməsinə və bununla bağlı oxuduqları müxtəlif məzmunlu mətnlərin mahiyyətini çətinliklə başa düşmələrinə gətirib çıxarır (Demidova, Gribov, & Gigolo, 2018).

Baza səviyyəsinin yoxlanılmasına aid tapşırıqların elementləri içərisində öyrənicilərin əsasən qarşılaşdığı çətinliklər qüvvələrin superpozisiyası, müqavimət qüvvələrinin təsir göstərdiyi sistemlərdə enerjinin dəyişməsi və mexaniki enerjinin saxlanması, sabit cərəyan qanunlarında Kirhof qaydalarının tətbiqi, cərəyanlı naqillərin qarşılıqlı təsirinin və cərəyanlı naqildən müəyyən məsafədə maqnit sahəsinin induksiyası və intensivliyinin təyininə və s. aiddir (Romaşkeviç, 2005). Yüksək çətinlik səviyyəsinə malik tapşırıqlar içərisində təcürbənin gedişinin planlaşdırılması, praktik məsələlərdə mətndə verilmiş informasiyadan istifadə bacarığı da lazımi səviyyədə olmur. Yoxlama işlərinin nəticələri öyrəniciləri hazırlıq səviyyəsinə görə qruplara ayırmağa imkan verdiyindən, onların keçirilməsi mühüm əhəmiyyətə malikdir (Demidova, Kamzeyeva, Qribov, 2016).

Aşağı hazırlıq səviyyəsinə malik birinci qrupda (16-17 %) daha yüksək nəticə Fundamental qanun və prinsiplərinin yoxlanılmasına aid tapşırıqlarda müşahidə olunur. İkinci qrupda yer alan öyrənicilər (73,4 %) baza çətinlik səviyyəsinə uyğun tapşırıqların yerinə yetirilməsində bütövlükdə fizika kursunun məzmununu yaxşı mənimsədiklərini nümayiş etdirirlər. Bu qrupda metodoloji və fiziki məzmuna malik mətnlərlə iş sahəsində bacarıqların müəyyən problemlər yaratdığı görünür.

Daha yüksək nəticələr qapalı tipli tapşırıqların cavablarının tapılmasında və cavabları müstəqil olaraq formalaşdırmaq tələb olunan tapşırıqların yerinə yetiriməsində özünü daha qabarıq göstərir (Abasquliyev, Mecidova, 2018). Bu qrupa daxil olan öyrənicilər fiziki kəmiyyətlərin tədqinin aparılma ardıcıllığından başqa, baza səviyyəsində yoxlanılan tapşırıqların bütün spektrində yüksək

nəticələr göstərirlər. Bu qrup üçün fənlərarası əlaqələrdən istifadənin tətbiqinin bir çox hallarda çətinlik törətdiyi də gözdən qaçmır. Çox təəssüf ki, yüksək hazırlıq qrupuna, dördüncü qrupa ($\approx 9{,}6$ %) düşən öyrənicilərin sayı azlıq təşkil edir. Bu qrupa düşən öyrənicilər fizikanın kursunda formalaşmış bütün daha vacib olan elementləri mənimsəməkdə yüksək hazırlıq səviyyəsi nümayiş etdirirlər (İsmayılov, 2001).

## Nəticə

Fizikadan yoxlama tapşırıqlarının işlənib hazırlanmasına ümumi yanaşma başqa fənlərdən də (riyaziyyat, kimya) olan yoxlama tapşırıqlarının analizinin həyata keçirilməsinə imkan verir ki, bu da fənlərarası əlaqələrin daha da möhkəmlənməsinin baza prinsiplərinə köməkçi ola bilər. Belə ki, yoxlama işlərinin qarşılıqlı müqayisəsi alınmış nəticələrin reallıq dərəcəsinin göstəricisi rolunu oynaya bilər.

Bu reallıq əsasında fənlərarası metodikanı və müxtəlif fənləri tədris edən müllimlərə fənnin tədrisi zamanı ağırlıq mərkəzini hansı istiqamətdə dəyişməyin mümkünlüyünü təyin edə bilər.

Porifilli tədris müəsisələrində yoxlama işləri vasitəsilə obyektiv qiymətləndirmənin tələblərinin real vəziyyətini müəyyən etməyə imkan verər.

## Ədəbiyyat


1. Cəfərov, E. (2013). *Fizika.* Elm.
2. Demidova, M., Kamzeyeva, E., Qribov, V. (2016). İmtahan modellərinə yanaşma üsulları. *Pedoqoji ölçmələr,* 2.
3. Əhmədov, F. (2008). *Fizika məsələləri.* Adiloğlu.
4. İsmayılov, T. (2001). *Fizika*. AAHM mətbəəsi.
5. Qocayev, E., Əliyev, S. (2011). *Fizika kursu.* Təhsil.
6. Rəsulova, A., İsmayılov, T. (2022). *Mexanika və molekulyar fizikadan məsələlər toplusu*. Jeko Print.
7. Osmanov, S., Paşayev, G. (2021). *Mexanika Molekulyar Fizika.* I hissə. AAHM mətbəəsi.
8. Yalçın, C. (2012). *Fiziğin Temelleri.* Arkadaş Yayınevi.
9. Zülfüqarov, E., Qasımov, Q., Qasımova, V. (2018). *Ümumi fizika kursu.* Təhsil NPM.
10. Abasguliyev, A., & Mejidova, J. (2018). *Kniga IQ testov (uchebnik).* Izdatelskiy dom Internauka.
11. Demidova, M., Gribov, V., & Gigolo, A. (2018). *Tipovye zadaniya. Mekhanika. Molekulyarnaya fizika.* Prosvesheniye.
12. Romashkevich, A. (2005). *Fizika.* Drofa.


Daxil oldu: 20.09.2024
Baxışa göndərildi: 06.12.2024
Təsdiq edildi: 26.01.2025
Çap olundu: 22.02.2025

https://doi.org/10.36719/2663-4619/111/104-109

**Aytan Ibazade**
Baku State University
Master student
https://orcid.org/0009-0002-2188-8590
aytenibazade655560@gmail.com

# Dynamics of Renewable Energy Contracts: Addressing Energy Needs and Environmental Concerns in Legal Transactions

## Abstract

Renewable energy agreements, which are an important part of modern legal transactions, ensure that energy needs are met in a sustainable and environmentally responsible manner. This article examines the role of renewable energy agreements in legal transactions and solutions for meeting energy needs in a sustainable and environmentally responsible manner. The limited nature of energy resources and the environmental impacts of fossil fuels have increased the importance of renewable energy resources. In this context, the place and effects of international agreements and national legislation in the field of renewable energy are examined. The aim of the article is to analyze the positive effects of the use of renewable energy resources on environmental sustainability and economic development, to evaluate the effectiveness of legal regulations in this field and to investigate ways to improve current practices. The European Union's directives on renewable energy and the success of energy performance contracts in other countries are examined with examples. A special emphasis is placed on the development of renewable energy policies in energy exporting countries such as Azerbaijan, and legal and institutional regulations are evaluated in this direction. In addition to the role and economic benefits of renewable energy resources in combating climate change, contract models that increase energy efficiency are also included in the scope of the research. The article aims to provide practical solutions to achieve sustainability goals in the field of energy.

***Keywords:*** *energy, energy resources, energy contracts, natural gas, coal*

**Aytən İbazadə**
Bakı Dövlət Universiteti
magistrant
https://orcid.org/0009-0002-2188-8590
aytenibazade655560@gmail.com

# Bərpa olunan enerji müqavilələrinin dinamikası: hüquqi əməliyyatlarda enerji ehtiyacları və ekoloji narahatlıqlar

## Xülasə

Müasir hüquqi əməliyyatların mühüm hissəsi olan bərpa olunan enerji sazişləri enerji ehtiyaclarının davamlı və ekoloji cəhətdən məsuliyyətli şəkildə ödənilməsini təmin edir. Bu məqalə bərpa olunan enerji sazişlərinin hüquqi əməliyyatlardakı rolunu və enerji ehtiyaclarını davamlı və ekoloji cəhətdən məsuliyyətli şəkildə qarşılamaq üçün həll yollarını araşdırır. Enerji resurslarının məhdud təbiəti və qalıq yanacaqların ətraf mühitə təsiri bərpa olunan enerji resurslarının əhəmiyyətini artırmışdır. Bu kontekstdə bərpa olunan enerji sahəsində beynəlxalq müqavilələrin və milli qanunvericiliyin yeri və təsiri araşdırılır. Məqalənin məqsədi bərpa olunan enerji mənbələrindən istifadənin ekoloji dayanıqlığa və iqtisadi inkişafa müsbət təsirlərini təhlil etmək, bu sahədə hüquqi tənzimləmələrin effektivliyini qiymətləndirmək və mövcud təcrübənin təkmilləşdirilməsi yollarını araşdırmaqdır. Avropa Birliyinin bərpa olunan enerji ilə bağlı direktivləri və digər ölkələrdə enerji icrası müqavilələrinin müvəffəqiyyəti nümunələrlə araşdırılır. Azərbaycan kimi enerji ixrac edən ölkələrdə bərpa olunan enerji siyasətinin inkişafına xüsusi diqqət yetirilir və bu istiqamətdə hüquqi

və institusional qaydalar qiymətləndirilir. İqlim dəyişikliyi ilə mübarizədə bərpa olunan enerji mənbələrinin rolu və iqtisadi faydaları ilə yanaşı, enerji səmərəliliyini artıran müqavilə modelləri də tədqiqatın əhatə dairəsinə daxildir. Məqalə enerji sahəsində davamlılıq məqsədlərinə nail olmaq üçün praktik həllər təqdim etmək məqsədi daşıyır.

***Açar sözlər:*** *enerji, enerji resursları, enerji müqavilələri, təbii qaz, kömür*

## Introduction

One of the most important and indispensable needs of humanity is energy. Today, energy consumption per capita is used as a measure of development. In this century, the need for energy has increased considerably with the increasing population and developing technology. Currently, one of the most important problems in the world is the availability and continuity of energy.

Energy, defined as the ability to do a job, is one of the basic inputs of the economy and a healthy development; It is possible to have cheap, sufficient, quality and reliable energy sources (Choshkun, 1982, p. 58).

**Research**

Energy, which has become an indispensable element of our lives, has been one of the factors that most affected economic development since the second half of the 20th century. With this feature, energy, which is a strategic source of life for every country, has become one of the basic tools of development, especially in developing countries. The problem of how to meet the energy need in the future, which is increasing in parallel with its importance, has led countries to search for new energy fields. Thus, energy, which is an important element of international power struggles, conflicts and also international cooperation, has gained an international dimension. Energy will continue to be at the forefront of the economic and social development of countries in the coming centuries (Prugh, Flavin, & Sawin, 2005, p. 100).

**Exploring Renewable Energy Contracts: Addressing Energy Needs and Environmental Concern**

The introduction of renewable energy sources into the extraction, storage, and utilization of various types of energy is currently considered one of the most promising directions. An analysis of key statistical data and theoretical developments indicates the growing relevance of regenerative energy as a solution to global challenges in energy and environmental sustainability.

Renewable energy sources are characterized by their ability to replenish naturally, primarily through the flow of solar radiation reaching the Earth's surface, which ensures an almost inexhaustible supply in the foreseeable future. Energy sources such as solar, wind, hydropower, and bioenergy are already being actively utilized and are gaining popularity as environmentally friendly and sustainable alternatives to fossil fuels.

Examples of renewable energy use include its integration into power grids, providing energy to remote areas, and applications in industry. These approaches contribute to reducing carbon dioxide emissions, improving quality of life, and ensuring sustainable development.

Thus, the potential of renewable energy sources is evident, and their continued development serves as a key solution to addressing global energy and environmental issues.

There is currently positive legislative and practical experience in transitioning to renewable energy sector resources. Among the countries where the energy sector is largely supported by regenerative sources, several members of the European Union stand out, such as Germany and Denmark. Additionally, political and legal measures to promote the development of renewable energy sources have been implemented in countries like Switzerland, Canada, Iceland, and others.

The main fossil fuels are oil, coal and natural gas. In the world's current energy consumption, oil ranks first with a share of 37 %, followed by coal with a share of 27 % and natural gas with a share of 24 %. Today, strategies for the supply of oil and natural gas play a major role in the development and foreign policies of countries (BP, 2005).

Despite all the efforts spent on searching for alternative energy sources and developing technologies used in the field of energy, most of the increases in energy demand in the coming period are expected to be met by oil and natural gas.

Energy resources can be classified in many different ways (such as material state, storable, convertible, renewable, usable, solar-based, etc.). Classification based on usability and renewability is common (Karaosmanoghlu, 2004, p. 14).

They are energy sources that cannot be regenerated when consumed as an energy raw material. Fossil energy resources such as coal, oil and natural gas, and uranium and thorium, which are nuclear energy raw materials, are non-renewable energy resources.

The first political document establishing the goals for the development and use of renewable energy was adopted at the European Union level in 1997. Titled *"Renewable Energy: White Paper Laying Down a Community Strategy and Action Plan"*, it aimed to achieve a 12 % share of renewable energy implementation across the European Union by 2010.

This document contained an action plan aimed at creating fair market opportunities for the use of renewable energy sources, ensuring them without excessive financial burden, and identified the following measures: non-discriminatory access to the electricity market; tax and financial incentives and regimes; new directions for the development of bioenergy for transport, heating and electricity; measures to increase the share of biofuels market, promotion of biogas use and development of solid biomass markets; promotion of renewable energy sources (for example, solar in the construction sector, both in the modernization of buildings, facilities, and in new construction cases.

One of the first legal documents of the European Union was the *EU Directive on Electricity Production from Renewable Energy Sources* (2001/77/EC), which aimed to promote the use of renewable energy sources in electricity production. This legislative act was more programmatic in nature, as it set national targets for renewable energy production for individual member states.

Subsequently, the *EU Directive on Electricity Production from Renewable Energy Sources* (2001/77/EC) was updated with the adoption of another regulatory document. Further legal development in the field of renewable energy is associated with the adoption of a specific regulatory act, the *Renewable Energy Directive* (2009/28/EC).

Natural gas is an energy source formed by the natural transformation of organic substances in the lower layers of the earth over millions of years, changing under pressure and heat and reaching their current state. It is among the fossil fuels that can be used without any processing as it is extracted from its source (TMMOB, 2006, p. 130).

One of the most critical points of our age is the efficient use of energy. Considering the limited energy resources despite the increasing energy demand and the effects of energy production on climate change, energy efficiency is not a choice but a necessity. With steps such as the oil crisis in the 1970s, the 1992 Rio Conference, the 1997 Kyoto Protocol, and the Paris Agreement that came into force in 2016, climate change and energy efficiency issues have gained importance and awareness among the masses.

All of this contributed to the development and justification of one of the main concepts of the 21st century – the concept of sustainable development, which has become the ideology for the world's development in the coming years.

According to Article 6 of the Paris Agreement, the commitment to sustainable development became a priority for the subsequent policies of the countries that signed it, with voluntary participation and no restrictions on greenhouse gas emissions, where the participants set their own individual targets.

The Agreement established the need for "adaptation measures" (Article 2), defined as the actions taken by a country to reduce vulnerability to climate change and enhance its ability to adapt to its negative consequences. It is impossible to consider the adoption of adaptation measures without reducing the carbon footprint. Given the large number of factors influencing a country's carbon footprint, we will consider just one – greenhouse gas emissions and the possibility of reducing such emissions.

The spread of energy performance contracts is parallel to the development of energy service companies (ESCO). Energy service companies can be defined as natural or legal entities that provide energy services or other energy efficiency improvement measures and accept a certain degree of financial risk in doing so (Official Journal of the European Union, 2006).

Country policies are one of the cornerstones that direct the development of ESCO activities, and different countries have carried out different legal infrastructure studies according to their sector conditions. For example, in some countries such as China, while government policies increase the private sector's tendency towards ESCO, there are elements that hinder the development of the ESCO market in the public sector (IEA, 2018). On the other hand, the USA has carried out extensive work to encourage the use of energy performance contracts in the public sector, such as the development of standard contract documents, changes in purchasing procedures and the provision of project facilitators (Garbuzova-Schliftern & Madlener, 2019, p. 565). As a result, the ESCO market in the USA has found the opportunity to develop in the public sector.

A legal and financial framework has been drawn for the energy performance contract market with the EU-Energy Performance Commitment Campaign (EPCC) initiated by the European Commission. Energy performance contracts in Russia were introduced by federal law No. 261 (Garbuzova-Schliftern & Madlener, 2019, p. 570). However, it could not develop at the desired pace as a result of banks considering ESCO applications as risky.

When we look at the Asian continent, there are various financial programs to encourage the use of energy performance contracts in countries such as Singapore and Taiwan (Lee & Lam, 2016, p. 118). However, the real significant share in the energy performance contracts market belongs to China. When we look at the development of the energy performance contract in China, it can be seen that the China Energy Saving Incentive Project in 1996 was an important milestone. Financial assistance was received from the Global Environment Fund for the project in question, and energy management companies were established in three cities: Beijing, Liaoning and Shandong. At the 2010 Copenhagen Conference, the Chinese government committed to reduce carbon emissions by 40-45 % by 2020, which also increased government support for energy performance contracts. As a result of these and similar developments over the years, China has gained its current significant share in the energy service and energy performance contracts markets (Jinrong & Enyi, 2011, p. 199).

Energy efficiency began to gain increasing importance among international energy policies in the 1970s. The United Nations held its first environmental conference in Stockholm in 1972 (Kaya, 2020, p. 170). Then, the oil crises that occurred in 1973 and 1979 made more people aware of the importance of energy efficiency. Climate change gained greater recognition with the 1992 Rio Conference and the 1997 Kyoto protocol, and targets were set to control climate change with the Paris Agreement, which came into force in 2016. These developments have accelerated energy efficiency investments. With the increasing importance given to energy efficiency investments, energy performance contracts have also come to the fore as a financing method. When we look at the structure of EPS, the customer has the opportunity to save on energy costs while improving his social image and increasing his value. On the other hand, the implementing company can establish a long-term partnership based on mutual trust and have the opportunity to conclude new contracts with the successful results achieved. In summary, an energy performance contract can provide multifaceted benefits such as the creation of new job opportunities for both the customer and the energy service company, the spread of more innovative and efficient applications, reduction of energy demand, multifaceted increase in building/company value and competitive advantage (European Union, 2019, p. 45).

Despite being rich in energy resources and recognized as an energy resource exporter worldwide, the use of renewable energy sources has always been a focal point in the Republic of Azerbaijan. One of the key objectives of the energy security policy implemented under the leadership of President Ilham Aliyev is to strengthen the use of renewable energy sources in our country.

As a continuation of the work done in this area, by the Decree No. 1159 of the President of the Republic of Azerbaijan dated September 22, 2020, the State Agency for Renewable Energy Sources under the Ministry of Energy of the Republic of Azerbaijan was established, and the Agency's Charter was approved.

In order to develop the renewable energy sector in our country, improve the legal and institutional environment in this area, and create a favorable policy, relevant laws and regulatory legal acts have been adopted. In recent years, work in this area has continued, and the law titled "On the Use of

Renewable Energy Sources in Electricity Production" (№ 339-VIQ, dated May 31, 2021) has been approved, which makes a special contribution to the development of renewable energy.

In Article 5 of the document *"Azerbaijan 2030: National Priorities for Socio-Economic Development"*, approved by the Presidential Decree on February 2, 2021, issues related to climate change and combating it, as well as the application of renewable energy principles based on the green energy space in all sectors of the economy, have been reflected. According to the priorities for the country's socio-economic development, more attention is now being paid to the use of renewable energy sources and the expansion of "green" technologies in both the present and future periods. Within the scope of this work, studies are ongoing throughout the country to identify and prioritize areas with renewable energy potential. These National Priorities are also of special importance in the implementation of commitments arising from the UN's "Transforming Our World: The 2030 Agenda for Sustainable Development".

## Conclusion

Today, despite the increasing energy need due to the development of economies, the limited energy resources have created the necessity of ensuring continuity in energy resources.

Energy, which is indispensable for economic and social development, is of critical importance, especially for countries with limited domestic resources. Accordingly, in balanced and advanced development, energy is the determining factor in the welfare of people and the development of the country's economy. Energy demand; Providing sufficiently efficient, reliable, economical, continuous and environmentally friendly conditions in every period should be among the main objectives. The key to remaining as independent and diversifying as possible in terms of energy potential is the development of own resources.

## References

1. BP. (2005a). *Statistical Review of World Energy*.
2. European Union. (2019). *Technical Support Project for Improving Institutional Capacity in Energy Efficiency.* NIRAS, 190.
3. Garbuzova-Schliftern, M., & Madlener, R. (2019). AHP-based risk analysis of energy performance contracting projects in Russia. *Energy Policy,* 97, 559-581.
4. IEA. (2018). *Energy Service Companies (ESCOs).* https://www.iea.org/reports/energy-service-companies-escos-2
5. Jinrong, H., & Enyi, Z. (2011). Engineering Risk Management Planning in Energy Performance Contracting in China. *Systems Engineering Procedia*, 1, 195-205.
6. Lee, P., Lam, P., & Lee, W. L. (2016). Risks in Energy Performance Contracting (EPC) projects. *Energy and Buildings*, 92, 116-127.
7. Official Journal of the European Union. (2006). *Directive 2006/32/Ec of the European Parliament and of the Council of 5 April 2006 on Energy End-Use Efficiency and Energy Services and Repealing Council Directive 93/76/Eec*.
8. Coshkun, A. (1982, January 14). Enerjiyə qənaət paneli (Energy saving panel). *İstanbul Ticarət Palatası Nəşri, Seminar Seriyası*, 11, 95.
9. Karaosmanoghlu, F. (2004). *Enerjinin önəmi, təsnifatı, resurslara tələb, balans və gələcək enerji mənbələri* (Importance of Energy, Classification, Resource Demand, Balance and Future Energy Sources). Dünyada və Türkiyədə Enerji və Su Resurslarının Milli və Beynəlxalq Təhlükəsizliyə Təsirləri Simpoziumunun Materialları, Müharibə Akademiyaları Nəşrləri, 14-15.
10. Kaya, H. E. (2020). Kyotodan Parisə Qlobal İqlim Siyasətləri (Global Climate Policies from Kyoto to Paris). *Meriç Beynəlxalq Sosial və Strateji Araşdırmalar Jurnalı*, 4(10), 165-191.
11. Prugh, T., Flavin, C., & Sawin, J. L. (2005). *Neft iqtisadiyyatının dəyişməsi, dünyanın vəziyyəti* (The changing oil economy, the state of the world). Tema Yayınları.
12. TMMOB. (2006). *TMMOB Enerji Raporu* (TMMOB Energy Report). Yağmur Ofset.

https://doi.org/10.36719/2663-4619/111/110-114

**Nəsibə Hüseynli**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
https://orcid.org/0009-0001-1603-1368
nasibahuseynli@gmail.com

# Davamlı inkişaf və təhsil: Qarabağda yeni üfüqlər

**Xülasə**

Qarabağda davamlı inkişaf, münaqişədən sonrakı bərpa prosesində təhsilin yenidən qurulması və strateji bir alət kimi istifadəsini tələb edir. Təhsil, ekoloji məsuliyyət, sosial bərabərlik və iqtisadi davamlılıq prinsiplərini birləşdirərək gələcək nəsilləri hazır edir. Münaqişədən sonra təhsil etimad yaratmaq, sosial harmoniyanı təşviq etmək və ekoloji problemlərin həllində mühüm rol oynayır.

Təhsil proqramlarına ekoloji biliklərin daxil edilməsi Qarabağda davamlılıq üçün əsasdır. Bu, tələbələrdə tənqidi düşüncəni inkişaf etdirir və iqlim dəyişikliyi, resursların idarə edilməsi kimi problemlərin həllinə yönəlmiş bacarıqlar formalaşdırır. Təhsil həm də icma ilə əlaqə qurmaq və kollektiv fəaliyyət təşəbbüslərini inkişaf etdirmək üçün platforma rolunu oynayır.

Qarabağda davamlı inkişafın qarşısında bir sıra maneələr mövcuddur, lakin bu, fürsətlər də yaradır:

- **Məhdud infrastruktur**: Bərpa olunan enerji layihələri ilə həll edilə bilər.
- **İqtisadi qeyri-sabitlik**: Ekoturizm təşviqi iqtisadiyyat üçün yeni imkanlar yarada bilər.
- **Təhsil resurslarının çatışmazlığı**: QHT-lərlə birgə proqramlarla aradan qaldırıla bilər.
- **Gənclik miqrasiyası**: Yerli iş yerləri təşəbbüsləri ilə azaldıla bilər.

Siyasi sabitlik və resursların bərabər paylanması, təhsil imkanlarının genişləndirilməsi üçün vacibdir. Münaqişələr və siyasi gərginliklər resursların yayındırılmasına səbəb olur və təhsil təşəbbüslərini çətinləşdirir.

Təhsilin davamlı inkişaf üçün təkan rolu Qarabağda əhəmiyyətlidir. Təhsil müəssisələri ekoloji problemləri həll etmək, sosial məsuliyyəti təşviq etmək və icmaları bir araya gətirmək üçün bir platforma ola bilər. Bu yanaşma həmçinin beynəlxalq tərəfdaşlıqlar və innovativ strategiyalar vasitəsilə regionu daha davamlı və ədalətli bir cəmiyyətə çevirmək potensialına malikdir.

***Açar sözlər:*** *Qarabağ, davamlı inkişaf, təhsil strategiyaları, post-münaqişə bərpası, ekoloji təhsil, sosial bərabərlik, iqtisadi davamlılıq, gənclik miqrasiyası, təhsil resurslarının çatışmazlığı, təhsil və ətraf mühit*

**Nasiba Huseynli**
Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
Master student
https://orcid.org/0009-0001-1603-1368
nasibahuseynli@gmail.com

# Sustainable Development and Education: New Horizons in Karabakh

**Abstract**

Sustainable development in Karabakh requires leveraging education as a strategic tool during the post-conflict rebuilding process. Education prepares future generations by integrating principles of environmental responsibility, social equity, and economic sustainability. In the aftermath of conflict, education plays a crucial role in building trust, promoting social harmony, and addressing ecological challenges.

Incorporating environmental knowledge into educational programs is fundamental to achieving sustainability in Karabakh. This approach fosters critical thinking among students and develops skills to tackle issues like climate change and resource management. Education also serves as a platform for community engagement and advancing collective action initiatives.

Several challenges hinder sustainable development in Karabakh, but they also present opportunities:

**Limited Infrastructure:** Can be addressed through renewable energy projects.

**Economic Instability:** Promoting ecotourism can create new economic opportunities.

**Lack of Educational Resources:** Can be mitigated through collaborative programs with NGOs.

**Youth Migration:** Can be reduced by creating local employment opportunities.

Political stability and equitable resource distribution are crucial for expanding educational opportunities. Conflicts and political tensions divert resources and hinder educational initiatives.

Education's role as a driver of sustainable development is significant in Karabakh. Educational institutions can serve as platforms for addressing environmental issues, fostering social responsibility, and uniting communities. This approach also has the potential to transform the region into a more sustainable and equitable society through international partnerships and innovative strategies.

***Keywords:*** *Karabakh, sustainable development, education strategy, post-conflict recover, environmental education, social equity, economic sustainability, youth migration, lack of educational resources, education and environment*

## Giriş

### Davamlı inkişafın ümumi baxışı və təhsildəki əhəmiyyəti

Davamlı inkişaf, xüsusilə münaqişədən sonra bərpa dövründə olan Qarabağ kimi ərazilərdə təhsil prioritetlərini yenidən müəyyənləşdirmək üçün təməl rolunu oynayır. O, ekoloji qorunma, sosial bərabərlik və iqtisadi dayanıqlılığı birləşdirən hərtərəfli tədris yanaşmasını vurğulayır. Bu prinsipləri təhsil sistemlərinə daxil etməklə, təhsil müəssisələri tələbələri XXI əsrin aktual problemlərini həll etmək üçün gücləndirə bilər. Münaqişədən sonrakı şəraitdə təhsil etimad qurmaq və birliyi təşviq etmək üçün mühüm vasitədir. Davamlılıq prinsiplərinin tədris proqramlarına daxil edilməsi, tələbələrə cəmiyyət, ətraf mühit və iqtisadi sistemlərin qarşılıqlı əlaqəsini başa düşmək imkanı yaradır. Bu yanaşma onları münaqişələri həll etmək, sosial harmoniya qurmaq və icmaları qısa müddətli mənfəətlərdən üstün tutaraq uzunmüddətli rifaha yönəltmək bacarığı ilə təmin edir (Əliyev, 2002).

### Davamlı təhsilin mahiyyəti

Davamlı təhsil ənənəvi tədris prosesini aşır; o, tələbələri davamlı gələcək yaratmaqda fəal iştirak etməyə ruhlandırır. Tələbələr resursları qorumağın, ətraf mühitə təsirləri azaltmağın və bərabərlik və ədaləti dəstəkləyən siyasətləri müdafiə etməyin praktiki yollarını öyrənirlər. Bu dərslər onları qlobal düşünməyə və yerli fəaliyyət göstərməyə təşviq edir, onların töhfələrinin həm qısa, həm də uzun müddətli təsirini təmin edir (Mehdiyev, 1999).

### Qarabağda davamlı inkişafın təhsildəki rolu

Təhsil, Qarabağda icmaların yenidən qurulması və təcili ekoloji, sosial və iqtisadi problemlərin həlli üçün tələb olunan vasitələri və imkanları təmin edən davamlı inkişafın əsas hərəkətverici qüvvəsidir. Təhsil vasitəsilə davamlılıq prinsiplərinin tədrisi, tələbələri nəzəri biliklərlə yanaşı, davamlı inkişaf və dayanıqlılığa fəal töhfə vermək üçün praktik bacarıqlarla təmin edir (Azərbaycan Respublikasının Təhsil Nazirliyi, 2023).

### Ekoloji məsuliyyət və innovasiya

Davamlılıq prinsiplərinin tədris proqramlarına daxil edilməsi ekoloji məsuliyyətin vacibliyini vurğulayır. Tələbələr iqlim dəyişikliyi, biomüxtəliflik, resursların idarə olunması və bərpa olunan enerji həlləri haqqında məlumat alır, bu isə onlara ekoloji problemlərin həlli üçün innovativ strategiyalar tətbiq etməyə imkan yaradır. Bu yanaşma ətraf mühitlə daha dərin bağlılıq hissi aşılayır və uzunmüddətli ekoloji qayğı yaradır (Birləşmiş Millətlər Təşkilatı (UN) – "Davamlı İnkişaf Məqsədləri" (Sustainable Development Goals).

### Təhsil İnstitutlarının strateji rolu

Ali təhsil müəssisələri davamlı inkişafda liderlik etmək üçün unikal mövqeyə sahibdirlər. "Times Higher Education Impact Rankings" (Riabçenko və b., 2023) göstərir ki, universitetlər iqlim dəyişikliyi, gender bərabərliyi və məsuliyyətli istehlak kimi qlobal problemlərə təsirlərini ölçə və artırma potensialına malikdirlər. Davamlılığa üstünlük verməklə, bu institutlar yaşıl və daha ədalətli bir cəmiyyət üçün siyasətlər və çərçivələr formalaşdırmağa kömək edə bilər (İsmayılov, 2022).

| İl | Savadlılıq faiz nisbəti | Qeydiyyat dərəcəsi ilkin faiz | Qeydiyyat dərəcəsi orta faiz | Davamlı inkişaf proqramlarının sayı |
|---|---|---|---|---|
| 2020 | 98.5 | 95 | 85 | 15 |
| 2021 | 98.7 | 96 | 87 | 18 |
| 2022 | 99 | 97 | 90 | 20 |
| 2023 | 99.2 | 98 | 92 | 22 |

**Qarabağda təhsilin davamlı inkişafa təsiri**

Təhsil proqramlarına ekoloji maarifləndirmənin daxil edilməsi Qarabağda davamlı inkişafı təşviq etmək üçün mühüm strategiyadır. Ekoloji təhsili məktəb proqramlarına inteqrasiya etməklə, müəllimlər ekoloji məsuliyyətə üstünlük verən bir nəsil yetişdirə bilərlər. Bu, regionda ətraf mühitin deqradasiyası ilə mübarizə aparmaq üçün vacib bir addımdır. Belə yanaşma tələbələrdə tənqidi düşüncəni inkişaf etdirir və onlara iqlim dəyişikliyi, biomüxtəlifliyin itirilməsi və resursların idarə olunması kimi mürəkkəb məsələləri həll etmək üçün bacarıqlar qazandırır (Azərbaycan Respublikası Qarabağ Regional Mərkəzi: Təhsil və mədəniyyət barədə məqalələr və hesabatlar). Tədqiqatlar təhsilə erkən mərhələdə qoyulan investisiyaların əhəmiyyətini vurğulayır və gənc nəsillərin rifahı və inkişafını təşviq etməyin gələcəkdə rifahın təməlini qurduğunu göstərir. Təhsil proqramlarına ekoloji prinsiplərin daxil edilməsi təkcə akademik nailiyyətləri dəstəkləmir, həm də davamlı təcrübələri və kollektiv fəaliyyəti təşviq etməklə icmanın dayanıqlığını artırır. Ekoloji təhsilin Qarabağdakı tədris proqramlarına daxil edilməsi uzunmüddətli davamlılıq yolunda mühüm bir addımdır. Bu yanaşma idarəetmə, dayanıqlılıq və birgəyaşayışı dəyərləndirən bir cəmiyyət formalaşdırır və gələcək nəsilləri sürətlə dəyişən dünyanın çağırışlarına cavab verməyə hazırlayır (Əfəndiyev, 2023).

**Qarabağda davamlı inkişaf üçün çağırışlar və fürsətlər**

Qarabağda davamlı inkişafa doğru yol həm əhəmiyyətli çağırışlarla, həm də davamlılıq və inkişaf üçün fürsətlərlə səciyyələnir. Münaqişədən sonrakı vəziyyət səhiyyə sistemlərini və infrastrukturunu kritik bir vəziyyətdə qoyub, bu da məqsədyönlü potensialın artırılmasını və icma iştirakını zəruri edir. Məsələn, səhiyyə sahəsində aparılan qiymətləndirmələr, ilk tibbi yardım üzrə təlimlər və Uşaq Xəstəliklərinin İnteqrasiya Olunmuş İdarəedilməsi kimi sübutlara əsaslanan təcrübələrin yerli ehtiyacların qarşılanmasında prioritet olduğunu vurğulamışdır (Təhsil Nazirliyinin Rəsmi Veb Saytı: Qarabağda təhsil ilə bağlı yeni layihələr və strategiyalar üçün). Regionun qeyri-müəyyən siyasi statusu davamlı inkişaf səylərini daha da çətinləşdirir. Bu vəziyyət beynəlxalq standartlara uyğunlaşma və xarici dəstək cəlb etmək üçün mürəkkəb mühit yaradır. Buna baxmayaraq, bu çətinliklər innovativ həll yollarının hazırlanması üçün fürsətlər də təqdim edir. Mövcud maneələrə baxmayaraq, bu çağırışlar təhsilin və davamlılığın inteqrasiyasını əhatə edən, xüsusi olaraq icmalara uyğunlaşdırılmış yanaşmaların qəbul edilməsinin vacibliyini vurğulayır. Bu, Qarabağın irəliləyişinin həm inklüziv, həm də uzunmüddətli olmasını təmin edir (Məmmədova, 2021).

| Çağırış | İmkanlar | Mövcud Vəziyyət | Potensial Təsir |
|---|---|---|---|
| Məhdud infrastruktur | Bərpa olunan enerji layihələrinə investisiya | Aşağı | Yüksək |
| İqtisadi qeyri-sabitlik | Ekoturizmin təşviqi | Orta | Orta |
| Ətraf mühitin deqradasiyası | İcma əsaslı mühafizə proqramları | Yüksək | Yüksək |
| Təhsil resurslarının çatışmazlığı | QHT-lərlə birgə təhsil proqramları | Aşağı | Yüksək |
| Siyasi gərginliklər | Sülh və inkişaf naminə beynəlxalq tərəfdaşlıq | Yüksək | Fərqlənir |
| Gənclik miqrasiyası | İnnovativ yerli iş yerlərinin yaradılması təşəbbüsləri | Yüksək | Orta |

**Sosial-siyası faktorların təhsil təşəbbüslərinə təsirinin qiymətləndirilməsi**

Sosial-siyasi faktorların təhsil təşəbbüsləri ilə qarşılıqlı əlaqəsi Qarabağ kimi regionlarda davamlı inkişafın formalaşmasında mühüm rol oynayır. Siyasi sabitlik, yaxud onun olmaması, təhsilin əlçatanlığına və keyfiyyətinə əhəmiyyətli dərəcədə təsir edir. Məsələn, postsovet Ermənistanında aparılan araşdırmalar göstərir ki, hakimiyyətin elita təbəqələrində cəmlənməsi sosial təcridə səbəb ola bilər və bu da marjinallaşmış qruplar üçün təhsil imkanlarını ciddi şəkildə məhdudlaşdırır. Bu cür dinamikalar təhsil sistemlərinin effektiv olması üçün zəruri olan resursların bərabər paylanmasına mane olur. Bundan əlavə, Dağlıq Qarabağ kimi bölgələrdə müşahidə edilən tarixi gərginliklər göstərir ki, davam edən münaqişələr təhsil strukturlarını birbaşa pozur və əsas təşəbbüslərə ayrılan resursları yayındırır (Azərbaycan Milli Kitabxanası: Qarabağ mövzusunda xüsusi elektron kitabxana bölməsi mövcuddur).

| İl | Amillər | Təsir balı | Etibarlı mənbə |
|---|---|---|---|
| 2023 | Siyasi sabitlik | 75 | World Bank |
| 2023 | Hökumətin maliyyələşdirilməsi | 70 | UNESCO |
| 2023 | İcma ilə əlaqə | 65 | Education International |
| 2023 | Beynəlxalq yardım | 80 | OECD |
| 2023 | İctimai münasibətlər | 60 | Pew Research Center |

**İctimai-siyasi amillərin təhsil təşəbbüslərinə təsiri**

## Nəticə

Qarabağda təhsil ekoloji, iqtisadi və sosial dayanıqlığı birləşdirən davamlı inkişaf üçün əsas hərəkətverici qüvvədir. Təhsil vasitəsilə icmaları gücləndirmək, gələcək nəsilləri hazırlamaq və uzunmüddətli rifah təmin etmək mümkündür.

## Ədəbiyyat


1. Azərbaycan Respublikasının Təhsil Nazirliyi. (2023). *Postmünaqişə dövründə Qarabağda təhsil strategiyaları.* Təhsil Nazirliyi Nəşriyyatı.
2. *Azərbaycan Milli Kitabxanası: Qarabağ mövzusunda xüsusi elektron kitabxana bölməsi mövcuddur*. www.anl.az.
3. *Azərbaycan Respublikası Qarabağ Regional Mərkəzi: Təhsil və mədəniyyət barədə məqalələr və hesabatlar*.
4. Əliyev, Ə. (2002). *Qarabağın mədəniyyət və maarif tarixi*. Elm.
5. *Birləşmiş Millətlər Təşkilatı (UN) – "Davamlı İnkişaf Məqsədləri"* (Sustainable Development Goals).
6. Əfəndiyev, S. (2023). *Qarabağda universitetlərin perspektiv inkişaf yolları*. Təhsil və elm.
7. Əliyeva, Z. (2020). *Qarabağın kənd məktəbləri: Çətinliklər və perspektivlər*. Təhsil ictimaiyyəti.
8. İsmayılov, V. (2022). *Şuşa və ətraf rayonlarda təhsil mədəniyyətinin bərpası*. Elm.
9. Mehdiyev, N. (1999). *Qarabağ: Təhsil və mədəniyyətin inkişaf mərhələləri.* Maarif.
10. Məmmədov, F. (2021). *Postmünaqişə dövründə Qarabağın təhsil sisteminin bərpası.* Qanun.
11. Məmmədova, R. (2021). *Azərbaycanın regionlarında ali təhsilin müasir inkişafı*. Maarif.
12. *Təhsil Nazirliyinin Rəsmi Veb Saytı: Qarabağda təhsil ilə bağlı yeni layihələr və strategiyalar üçün.* www.edu.gov.az.


Daxil oldu: 06.09.2024
Baxışa göndərildi: 07.11.2024
Təsdiq edildi: 04.01.2025
Çap olundu: 22.02.2025

Demokratik münasibət uşağa təkbaşına qərar vermək səlahiyyəti və məsuliyyət hissi verir. Biganə münasibət uşağı boşluqda qoyur. Demokratik münasibət uşağın şəxsiyyətinin və mənlik anlayışının inkişafına avtoritar və laqeyd münasibətdən daha müsbət təsir göstərir. Ardıcıl, balanslaşdırılmış sevgi və diqqət uşağın özünə inamını və hörmətini artırır. Valideynlər uşaqların həyatdakı münasibətləri, inancları, dəyərləri və şəxsiyyətin özünəməxsus xüsusiyyətləri üçün əsas istinad mənbəyidir.

## Ədəbiyyat

1. Abbasov, A. (2008). *Milli əxlaq və ailə etikası*.
2. Abbasov, A. (2010). *Pedaqogika.*
3. Abbasov, A. N., Əlizadə, N. Ə. (2000). *Pedaqogika*. Renessans.
4. Biller, R. (1988). *Təhsil zamanı psixologiyanın tətbiqi* (fars dilində).
5. Həsənov, A., Ağayev, Ə. (2007). *Pedaqogika.*
6. Kartles, C. (2007). *Uşaqlara ictimai məharətlərin aşılanması* (fars dilində).
7. Qasımova, L. N., Mahmudova, R. M. (2012). *Pedaqogika*. Dərslik. Çaşıoğlu.
8. Paşayev, Ə. X., Rüstəmov, F. A. (2010). *Pedaqogika*. Yeni kurs. Pedaqoji universitetlərin və ali pedaqoji məktəblərin tələbələri üçün dərs vəsaiti. Elm və təhsil.
9. Hüseynzadə, R., Allahverdiyeva, L. (2016). *Ailə pedaqogikası*. Dərslik.
10. Hüseynzadə, R. L., Əzizova, Z. M., Əliyev, S. H., Verdiyeva, Ü. M. *Pedaqogika*. Dərslik. Mütərcim.
11. Rzayev, B. (2003). *İdrak proseslərinin fəallaşdırılması yolları*. Şirvannəşr.
12. Talıbov, Y. R., Ağayev, Ə. Ə., Eminov, A., İsayev, İ. (2003). *Pedaqogika*. Dərs vəsaiti (Ali məktəblərin bakalavr pilləsi tələbələri üçün).

Daxil oldu: 13.10.2024
Baxışa göndərildi: 17.12.2024
Təsdiq edildi: 04.01.2025
Çap olundu: 22.02.2025

https://doi.org/10.36719/2663-4619/111/140-144

**Khanim Rahimova**
Baku, Azerbaijan
https://orcid.org/0009-0008-0150-5306
rehimova.xanim97@mail.ru

# Artificial Intelligence As a Remedy For Economic Crimes Throughthe Application of the Labeling Theory

**Abstract**

In the modern world, with technological development, economic crime rates are increasing daily. This creates questions about artificial intelligence and whether it is possible to protect data and avoid the detrimental effects of technology by itself. This article will discuss the connections between financial crimes, artificial intelligence, labeling theory, and the possible benefits of artificial intelligence over economic crimes by using the labeling theory which became more popular in criminological sciences in the 1960s years. It gives general information about financial crimes, labeling theory, controlling economic crimes, and artificial intelligence in anti-corruption. It clarifies the methods that can be implemented in artificial intelligence to gain more benefits. In this article I collect data about the economic crimes committed in Azerbaijan and proceed in Baku Court on the Grave Crimes, then generalize this data to find similarities between crimes, and find outcomes that could contribute to possible solutions.

***Keywords:*** *artificial intelligence, economic crimes, labeling theory, crime detection, financial crimes*

**Xanım Rəhimova**
Bakı, Azərbaycan
https://orcid.org/0009-0008-0150-5306
rehimova.xanim97@mail.ru

# Süni intellekt, iqtisadi cinayətlər, etiket nəzəriyyəsi, cinayətin müəyyənləşdirilməsi, maliyyə cinayətləri

**Xülasə**

Müasir dövrdə texnologiyanın inkişafı ilə birlikdə iqtisadi cinayətlərin sayında artımlar müşahidə edilmişdir. Bu suni intellektlə bağlı texnologiyanın mənfi cəhətlərini onun özü ilə aradan qaldırmaq mümkündürmü şəklində bir sıra sualları ortaya qoyur. Bu məqalə iqtisadi cinayətlər, süni intellekt və etiket nəzəriyyəsi arasındakı əlaqəni və 1960-ci illərdən bəri kriminoloqlar arasında məhşur olan etiketləmə nəzəriyyəsini süni intellektə tətbiq etməklə iqtisadi cinayətlərin qarşısının alınmasında ola biləcək faydaları mübahisələndirir. Məqalə iqtisadi cinayətlər, etiket teoriyası, iqtisadi cinayətlərin tənzimlənməsi, korrupsiya cinayətlərinə qarşı süni intellektin istifadə edilməsi haqqında ümumi informasiya verməklə yanaşı süni intellektindən fayda əldə etmək üçün tətbiq oluna biləcək metodları sadalayır. Bu məqalədə mən Azərbaycan Respublikasında baş verən və Bakı Ağır Cinayətlər Məhkəməsində baxılmış iqtisadi cinayətlərlə bağlı məhkəmə prosesləri əsasında ümumi data toplamış və daha sonra bu cinayətlər arasındakı bənzərliklər və çıxarılan nəticələr əsasında müəyyən həll yolu tapılmasını qeyd etmişəm.

***Açar sözlər:*** *süni intellekt, iqtisadi cinayətlər, etiket nəzəriyyəsi, cinayətin müəyyənləşdirilməsi, maliyyə cinayətləri*

## Introduction

Fraud, money laundering, environmental crimes, and corruption are some parts of the economic crimes which are also known as financial crimes. With the development of technology money

 

laundering and fraud are getting more hazardous for the people and governments. Cryptocurrency crimes have especially been widespread all over the world in recent years. Despite the government's spending huge amounts of money to prevent financial crimes, reports show that only 1 % of the crimes are recovered. Through the development of technology despite its detrimental effects it is also possible to use technology as a solution to these problems with the facilitate of some criminal theories. By the developments of criminological sciences, the criminologist asserts some theories, including labeling theory. Implementing labeling theory to artificial intelligence could be a solution for detecting economic crimes that are prepared with the power of technology. This article will discuss the problem by collecting data from cases of the court on the Grave crimes of Baku and some other literature, then discuss the connection between labeling theory, economic crimes, and artificial intelligence, and lastly give some solutions for these cases.

**Financial Crimes.** The range of ways to commit financial crimes is extensive, including theft, fraud, deception, blackmail, corruption, and money laundering. The risks often seem minimal while the potential rewards are substantial. Financial crime encompasses everything from simple theft or fraud carried out by individuals with malicious intent to complex schemes orchestrated by organized crime groups operating globally. These serious offenses have significant social and economic repercussions and are frequently connected to violent crime and even terrorism (6). Three key factors that need to be established in a money laundering case include: awareness of the illicit source of the funds, involvement in a financial transaction, and participation in the three stages of money laundering (Sanction scanner, 2024).

**Labeling theory.** Labeling theory got most popularity from the 1960s years by the criminologist. The first labeling theorist was Howard Becker. The core idea of this theory is when someone behaves in a way that others consider inappropriate, they are labeled as deviant by those around them, eventually, the person begins to accept and adopt this label as their own. For example, if someone from his childhood grows up in a family where their relatives act towards him without any reliance then this child star acting like an untruthful person who cannot make profit for him and others, also can easily hurt others (Rouhollahi, 2021). After the time this child grows and reaches mature age, he believes that he is not loyal and easily can act in illegal way. Inappropriate labels from society about someone can create a huge problem. It also means that if someone already got undesirable labels from others and he personalizes this label about himself, he has potential for any inappropriate behavior. In modern globalized life labels about someone can be tracked easily by social media or other technological improvements. This means that if someone already has negative labels it could be detected and clarified by artificial intelligence (Bonnie, 2019).

**Research**

**Artificial intelligence for crime detection.** We can briefly describe artificial intelligence as a simulation of human intelligence in technology but in a more advance way than human ability. Artificial intelligence more accurately can understand and analyze data than human beings can perform problem-solving or perception about something even if it hasn't happened yet. People use benefits of artificial intelligence in many areas of life such as medicine, economics, law etc (International Monetary Fund). In this article we will discuss the facility of artificial intelligence in crime detection and especially in economic crimes detection because the rate of economic crimes which has committed by using technology and especially artificial intelligence are increase day by day. So, we will clarify the detrimental effects of artificial intelligence in committed crime and then enlighten how we can change this effect to the positive way by the facility of artificial intelligence (This website is currently not available). Artificial intelligence can also track social media activity, collect data from the internet, analyze all collected information and make databases about all these procedures. Artificial intelligence can analyze crime data to identify high-risk people and predict potential criminal activities. Artificial intelligence can use information and data, then analyze them and come to conclusions about it. In the 1990s, there was growing interest in using AI for fraud detection (Rebe, 2023).

In 1993, the FinCEN Artificial Intelligence System (FAIS) was launched to help predict and evaluate money laundering activities. Within the next two years, FAIS processed over 200,000

transactions weekly and flagged 400 potential money laundering cases, amounting to around $1 billion (The Role of Financial Institutions in Preventing Economic Crime" (OECD Reports)).

Following the end of the second AI winter, AI technology advanced into new areas such as machine learning, data mining, virtual reality, and cases-based reasoning. ML, a subset of AI, uses algorithms that allow systems to improve automatically through experience, with little or no human input. It primarily relies on sources like experience, practice, training, and reasoning. More specifically, ML focuses on recognizing general pattern and approximating relationships in data, particularly in situations where no pre-existing analytical solution is available (Cybenko, 1989; Buchanan, 2019)

**Controlling Economic crimes.** There are several international organizations like The Financial Action Task Force, Association of Certified Financial Crime Specialist, Anti-money laundering and Financial Crime Institute, Transparency International, etc. The Financial Action Task Force creates policies to deter financial crimes but relies on governmental support for their implementation. Association of Certified Financial Crime Specialist provides a range of solutions centered on training, membership, and certifications related to financial crimes. Anti-money laundering and Financial Crime Institute works in partnership with universities and professional organizations to fight financial crimes. Transparency International aims to address global corruption by concentrating on three primary activities: advocacy, research and campaigning. Despite these organizations' attempts, financial crimes remain a big problem worldwide (Collins, 2019).

**Artificial Intelligence in anti-corruption.** Public and private organizations have a great curiosity about adopting Artificial Intelligence system against corruption. Artificial Intelligence can analyze a large volume of data and predict possible dangers about corruption and can detect fake suppliers more accurately. Artificial intelligence is a powerful tool against corruption, it fights against corruption with some methods, such as reviewing documents and emails for suspicious patterns of false reporting's, protecting of sensitive data, review public contracts for unusual clauses. By reviewing and public procurement, public audits, pattern detection, controlling data analyze, data protection, legislation and transparency (Acera, 2023).

**Methods.** The term data labeling is also popular in machine learning. Labels or tags are used to categorize or describe data, making it easier to identify and organize information. For example, on our smartphones, we might use labels like “wedding”, “holiday”, “family” to quickly find specific images or albums. In machine learning labeling data has also importance. The label identifies whether the transactions are suspected of being a money laundering transaction (Minkes, 2008). Some labeling techniques produce probabilistic training labels by evaluating the consensus and discrepancies among different data labeling sources. For example, the Snorkel model, created at Stanford University, generates labels based on the outcomes of multiple straightforward labeling functions crafted by experts. This model then assigns weights to each labeling function by assessing the level of agreement among the labels for each data point (Rouhollahi, 2021).

**Findings.** According to the data of rates of economic crimes which happened in Azerbaijan in last 3 years it is obvious that financial crimes contains 1 of 4 total crimes. At the bar chart below it is shown that total crime types and their percentages in last years (Philip, 2010).



Does technology matter for combating economic and financial crime? A panel data study. Technological and economic development of economy research by Achim, M. V., Văidean, V. L. & Borlea, N. S. (2021) their findings shows that he averages economic and financial crime score is roughly twice as high in low-income states compared to high-income states. Similar findings indicate that economic and financial crimes are more prevalent in low-income countries than in high-income countries. For example, a study by Achim et al. (2018), which compared two groups of European Union countries, reveals that the EU members, mostly representing developing countries, have an average shadow economy of 25.42 % of GDP, while the older, developed EU members have a much lower percentage of 14.48 %. Furthermore, a Pricewaterhouse Coopers (2018) report highlights that 15 % of financial entities in developing countries anticipate an increase in investments for fraud detection over the next two years, compared to only 9% in developed countries. The same study also found that 58 % of financial entities in developing countries (including financial companies, insurers, mutual funds, and other dealers) have actively fought money laundering in the past two years, whereas only 48 % of entities in developed countries have done the same (Achim, Vaidean, & Borlea, 2021).

## Conclusion

The International Monetary Fund reports that financial institutions will double their Artificial Intelligence spending by 2027 (International Monetary Fund). Despite every kind of attempt the rates of economic crimes are getting higher. This leads to the need to find out more innovative ways in this process. Similarly to the labeling by people in real life, people can also be labeled in social media by the use of technology. Artificial Intelligence can collect data about suspicious labels given by ordinary people on social media or other devices. Then artificial intelligence can process this data and find some suspicious factors. With the help of this method, authorities can investigate these kinds of people or groups and can take measures against illegal acts. For example, if someone is labeled as untruthful, dishonest, or deceptive artificial intelligence can collect this data about the exact person and sign this person's possible danger to the future of the community. With the help of artificial intelligence activities and life of these kinds of people can be tracked by authorities and considered as a potential danger. In conclusion, by implementing the labeling theory to artificial intelligence and by using this power against financial crimes rate of these types of crimes would soon drop.

## References

1. Acera, A. L. (2023, November 21). *Artificial Intelligence and the fight against corruption.* https://www.antifraucv.es/en/artificial-intelligence-and-the-fight-against-corruption/
2. Achim, M. V., Vaidean, V. L. & Borlea, N. S. (2021). Does technology matter for combating economic and financial crime? A panel data study. *Technological and economic development of economy*, 27(1), 223-261. https://doi.org/10.3846/tede.2021.13977
3. Bonnie, G. B. (2019, April 2). *Artificial Intelligence in Finance — The Alan Turing Institute*. https://www.turing.ac.uk/news/publications/artificial-intelligence-finance
4. Collins, D. (2019). *Foundation of International Economic law*. Edward Elgar Publishing.
5. *International Monetary Fund*. https://www.imf.org/en/Data
6. Interpol.in. https://www.interpol.int/eng/Crimes/Financial-crime
7. Minkes, L. (2008). *Corporate and White Colar crime, sage publication*.
8. Philip, J. C. (2010). *Economical Crime Control*. http://www.nber.org/papers/w16513
9. Rebe, N. (2023). *Artificial Intelligence: Crime, War, and Justice, International Press.*
10. Rouhollahi, Z. (2021). *Towards Artificial Intelligence Enable Financial Crime Detection.*
11. Sanction scanner. (2024, September 18). *Three elements that must be proven in a money laundering case.*
12. *The Role of Financial Institutions in Preventing Economic Crime" (OECD Reports).* https://www.oecd.org

https://doi.org/10.36719/2663-4619/111/145-162

**Kərim Novruzov**
Ağdam rayonu 95 nömrəli tam orta məktəb
https://orcid.org/0009-0001-7805-6552
karim.novruz@mail.ru

# Yazılmamış tariximiz silsiləsindən – xalq qəhrəmanı Abbasqulu bəy Şadlinski

**Xülasə**

Müasir sosial siyasət insanların həyat keyfiyyətinin yaxşılaşdırılmasına yönəlmişdir. Sosial rifah dövlətin mühüm siyasət alətlərindən biridir. Bu siyasət müxtəlif sosial risklərə qarşı müdafiəni təmin edir. Əmək bazarındakı dəyişikliklər sosial siyasətə təsir göstərir. Sosial siyasətin inkişafı rifahın artırılması ilə bağlıdır.

Sosial siyasət insanların rifahını təmin etmək üçün müxtəlif mexanizmlərdən istifadə edir. Dövlətin müdaxiləsi sosial problemlərin həllində vacib rol oynayır. Əhalinin imkanları və sosial ehtiyacları nəzərə alınmalıdır. Müasir dövrdə sosial rifah siyasəti müxtəlif formal çərçivələrdə tətbiq edilir. Sosial siyasətin davamlı inkişafı vacib amillərdən biridir.

Bu sulaşalar sizin təqdim etdiyiniz məqalənin əsas ideyalarına uyğun tərtib olunub. Əgər daha spesifik dəyişikliklər lazımdırsa, mənə bildirə bilərsiniz.

***Açar sözlər:*** *sosial siyasət, sosial rifah, sosial təminat, dövlət müdaxiləsi, sosial təhlükəsizlik, rifah cəmiyyəti, sosial bərabərlik*

**Karim Novruzov**
Aghdam district secondary school No. 95
https://orcid.org/0009-0001-7805-6552
karim.novruz@mail.ru

# From the Series Our Unwritten History – People's Hero Abbasgulu Bey Shadlinski

**Abstract**

Modern social policy is aimed at improving the quality of life of people. Social welfare is one of the important policy instruments of the state. This policy provides protection against various social risks. Changes in the labor market affect social policy. The development of social policy is associated with increasing welfare.

Social policy uses various mechanisms to ensure the well-being of people. State intervention plays an important role in solving social problems. The capabilities and social needs of the population must be taken into account. In modern times, social welfare policy is implemented in various formal frameworks. Sustainable development of social policy is one of the important factors.

These discussions are compiled in accordance with the main ideas of the article you submitted. If more specific changes are needed, you can let me know.

***Keywords:*** *social policy, social welfare, social security, state intervention, social security, welfare society, social equality*

## Giriş

*Zaman şəxsiyyəti, şəxsiyyət tarixi yaradır. Lakin şəxsiyyət zamanın axarını özünəməxsus şəkildə dəyişə bilər, ona yeni forma verən, yeni üslub gətirən və yeni çalarlarla bəzəyən fenomendir. Vətənpərvər şəxsiyyətin bütün fikri, düşüncəsi, əməli xalqının firavanlığına və dövlətin hegomonluğuna xidmət edir.*

Qədim türk yurdu olan Böyük Vedinin mərkəzində çox iri olan bir təpə vardı. Buraya vaxtilə Qalabürc deyərdilər. Ötən əsrin əvvəllərində buradakı qala hələ də dururmuş. Oradan baxanda Böyük Vedinin bütün evləri, məhəllələri çox aydın görünürmüş. Qalaça müdafiə məqsədilə hörülmüş, enli və uca palçıq divarla əhatə edilmişdi. Həmçinin qalaya üç tərəfdən giriş-çıxış qoyulmuşdu.

Tariximizin qanlı-qadalı 1918-1920-ci illərində Abbasqulu bəy Şadlinski erməni daşnaklarına qarşı ən ağır döyüşləri buradan idarə edibdir. İgid komandir Vedi uğrunda sonuncu döyüşü də məhz buradan idarə etmişdir. Lakin qeyri-bərabər döyüşdə hərbi sursatın tükəndiyini görüb dinc əhalini qorumaq üçün Vedini müvəqqəti tərk etməyə məcbur olubdur. Abbasqulu bəydən sonra qalaya daxil olan quldur daşnaklar buranı xarabalığa çeviriblər. Böyük bir qəhrəmanlıq tarixinə şahidlik edən qala da elə o vaxt uçurdulub dağıdılaraq böyük təpə əmələ gətiribdir. Tarixi Böyük Vedinin şimal qurtaracağındakı sarı torpaqlı təpəyə Sarıdolama deyilirdi. Burada ulu əcdadlarımızın əbədi uyuduğu qədim Sarıdolama qəbiristanlığı yerləşirdi. Təbiətin qüdrətindən yaranan silsilə qayalıqlara Gavur qalası deyilirdi. Buranı təbiət sanki qəhrəman vedililər üçün istehkam yaratmışdır. 1918-1920-ci illərdə Böyük Vedi kəndi daşnakların hücumlarına məruz qalanda Abbasqulu bəyin başçılıq etdiyi Vedibasar özünümüdafiə qüvvələri dəfələrlə burada düşməni darmadağın edib geri çəkilməyə məcbur etmişdir.

**Tədqiqat**

Son dərəcədə gözəl olan və narıncı rəngə çalan Gavurqala qayalıqlarındakı təbii, böyük meydanın bir tərəfində qaralan kaha ağzı vardı ki, bu mağara “Divlər otağı” adlanırdı. Əlbəttə ki, burada div yaşamayıbdır. Bəlkə də, tarixin hansısa dövründə Abbasqulu bəy kimi div hünərli igidlər yaşayıblar. Günbatana doğru uzanan sıldırım qayalarda olan mağara göyərçinlər mağarası adlanırdı. Çox güman ki, mağaranın bu adı orada həmişə çoxlu yaradanların və göyərçinlərin olması ilə bağlı olubdur. Gavur qalasının Ağdağa doğru uzanan hissəsinə Gavur qalasının Qumluğu, Qumlucası da deyirdilər. Bu ərazinin günbatan tərəfində qayaların arasındakı dərə ilə çay axırdı. Bu çaya Qotur bulağının mineral suyu qarışdığından dərə Qoturbulaq dərəsi adlanırdı. Qoturbulaq dərəsinin girəcəyində Damdıra adlı qaya vardı. Daşla çalınanda bu qaya çox qəribə, məhz tambur səsinə yaxın gur səs çıxarırdı ki, bu da onu Qobustandakı qavaldaşına daha çox oxşadırdı. Buradan bir qədər yuxarılarda isə Süzəni dölləyi adlanan yer vardı. Əyricə yaylağına yaz gec gələndə camaat öz qoyunlarını burada saxlayardı. Süzəni dölləyindən Millidərəyə doğru uzanan yol isə müqəddəs Allahu-Əkbər dağına gedirdi. Bu həmin Allahu-Əkbər dağıdır ki, Osmanlı dövləti Rusiya imperiyasının hərbi təcavüzünü dəf etmək məqsədilə 1914-cü il dekabrın 22-dən 1915-ci il yanvarın 15-dək Türkiyənin şərqində Sarıqamış əməliyyatını həyata keçirib. “Allahu-Əkbər” dağında şaxtalı hava şəraitində Osmanlı ordusunun çoxlu sayda hərbçisi dəhşətli şaxtadan donaraq və aclıqdan həlak olub (Azərbaycan tarixi yeddi cilddə, 2008).

Türk xalqına sarsıdıcı zərbə olan bu faciə Osmanlı dövlətinin Birinci Dünya müharibəsində məğlub olmasının əsas səbəblərindən biri kimi qəbul edilir. Yeri gəlmişkən onu da qeyd edək ki, Sarıqamışı Səlcuq komandanı Sultan Alparslan 16 avqust 1064-cü ildə Bizans kralı ilə müharibədə ələ keçirmişdi. Türkiyə bu əraziləri 1878-1879-cu illərdə Balkan müharibəsində itirmişdi. O vaxtdan həmin bölgə 1920-ci ilə qədər çar Rusiyasının işğalı altında olub. Şanlı Türk ordusu bütün çətinliklərə baxmayaraq 1920-ci ildə Sarıqamış torpaqlarını düşmən işğalından əbədi azad edib. Türkiyənin əsrarəngiz təbiətə malik Sarıqamış vilayətində indi geniş qış turizmi fəaliyyət göstərir. Vedinin qüdrətdən səngərli qalalı dağlarını xatırlatmaqda məqsədimiz odur ki, sanki təbiət əvvəldən olacaqları bilirmiş kimi belə bir möhtəşəmliyi özündə ehtiva etmişdir və burada doğulanların da təbii olaraq cəsurluqları ilə qəhrəman olmaqları mütləqdir. Abbasqulu bəy Şadlinski də məhz belə bir məkanda doğulub, böyüyüb, bərkiyib, igid yoldaşları ilə birlikdə qəhrəmanlıq salnaməsi yaratmışlar. Lakin tarix həmişə ədalətli olmadığı üçün Abbasqulu bəy Şadlinski və onun kimi onlarca igid soydaşlarımızın Azərbaycan xalqı qarşısında göstərmiş olduqları müstəsna xidmətləri nədənsə ört-basdır edilmişdir. Xalqımızın tarixində elə şəxsiyyətlər olub ki, adları ilə tariximizin unudulmuş qaranlıq yollarına işıq saçır, uzun əsrlik yollarımızı aydınlığa çıxarır. Belə oğulların adları nəinki bir xalqın, bir dövlətin bəzən bütün bəşəriyyətin mənəvi-psixoloji, fəlsəfi abidəsinə çevrilir. Biz onların xalqımızın qəhrəmanlıq tarixini yaşatdıqları adları qarşısında baş əyir, həqiqi qəhrəmanlığın rəmzi olan bu müqəddəs adları yad edirik və etməyə borcluyuq. Xalq onun azadlığı uğrunda vuruşanların

fəaliyyətini, qəhrəmanlığını unutmur, ona əfsanəvi sifətlər verərək yaşadır. Lakin zaman keçdikcə bu əfsanələr məhz əfsanə kimi danışılır, əfsanə kimi qeyd edilir (Əliyev, 1990).

Tarixi prosesin iştirakçıları böyük xalq kütlələri olsa da, tarixi prosesin real tarixi hadisə kimi yadda qalması, yazıya köçürülməsi üçün tarixçilərin fəaliyyəti olduqca vacibdir. Çox da uzaq olmayan tarixi keçmişimizə nəzər yetirdikdə görürük ki, öz ölümsüz həyatı ilə ölümsüzlük qazanan, özünü xalqının müqəddəs məhəbbətinə çevirən Abbasqulu bəyin qəhrəmanlığı kimi qəhrəmanlıq göstərmiş igidlərimizin fəaliyyəti tarixçilərimiz tərəfindən araşdırılmamışdır. Rusiya imperiyası dağılandan sonra Azərbaycan torpaqlarında ilk yerli özünüidarəetmə və özünümüdafiə orqanı formalaşdıran Vedi torpağında dünyaya gəlmiş Abbasqulu bəy Şadlinski olduğu kimi 1988-ci ildən başlayan Dağlıq Qarabağ münaqişəsi zamanı silahlı erməni quldur dəstələrinin hücumlarından Ağdərə sakinlərini kütləvi qırğınlardan xilas etmək üçün1989-cu ildə Azərbaycan Respublikasında ilk özünümüdafiə dəstəsini yaradan Novruzov Əvəz Əli oğlu olmuşdur. Onun təşəbbüsü və rəhbərliyi ilə bütün kəndlərdə özünümüdafiə dəstələri yaradılaraq 1989-1992-ci illərdə düşmənə ağır zərbələr vurulmuşdur. Abbasqulu bəyin 1918-1920-ci illərdə apardığı mübarizənin sonunda geri çəkilməsinin səbəbi Amerika-İngiltərə-Rusiya dövlətləri tərəfindən silahlandırılan daşnak respublikasının qaniçən ordularından camaatı xilas etmək olduğu kimi Əvəz Novruzovun rəhbərlik etdiyi özünümüdafiə dəstəsi də o vaxtkı hökumət və hakimiyyət orqanlarının xəyanətindən istifadə edən ermənistan silahlı qüvvələrinin qırğınından dinc sakinləri qorumaq üçün geri çəkilməyə məcbur olmuşdur. Hadisələr müxtəlif illərdə baş versə də, nəticə etibarilə eynilik təşkil edir. Abbasqulu bəyin rəhbərliyi ilə təkbaşına döyüşən Vedi özünümüdafiə dəstələri öz vətənlərində köməksiz qaldığı üçün geri çəkilir, həmçinin Əvəz Novruzovun rəhbərlik etdiyi Ağdərə rayonunun özünümüdafiə dəstələri Azərbaycan Respublikasına rəhbərlik edən qüvvələrin xəyanəti nəticəsində tək qaldığı üçün geri çəkilirlər.

Bütün bunlar bütov bir xalqın tarixidir. Əlbəttə ki, xalq öz qəhrəmanını unutmur, ona nəğmələr qoşur, təkrar-təkrar danışaraq əfsanələr yaradır. Ancaq bir məsələni unutmaq olmaz ki, zaman keçdikcə real tarixi qəhrəmanlarımız əfsanəvi qəhrəman kimi xatırlanacaqdır. Bu halın baş verməməsi üçün tarixçilərimizin üzərinə böyük məsuliyyət düşür. İstənilən hadisənin tarixi elmi ədəbiyyatda öz əksini tapmalıdır ki, elm onu qəbul etsin. Unutqanlığımızın, səhlənkarlığımızın, hətta məsuliyyətsizliyimizin nəticəsi olaraq tariximiz dəfələrlə düşmənlərimiz tərəfindən dəyişdirilib və təhrif olunmuşdur. Tarix o zaman yaşadılır ki, baş verən hadisələr vaxtında yazılır. Tarix həyatdır, həyatın içərisində hadisədir. Tarix həyatdır deyirik. Bəs bu həyatı necə salnamələşdirməliyik ki, gələcək nəsillərin də ötən həyatlardan və hadisələrdən xəbəri olsun? Tarix bəzən heç də olduğu kimi nəsillərdən-nəsillərə ötürülmür. O, kiminsə istəklərinin də qurbanı olur, təhriflərlə də üz-üzə qalır. Bəs necə etməli ki, yaşanan tarix olduğu kimi yaşadılsın. Axı buna bütün cəmiyyətlərin ehtiyacı var. İnsanlar öz həqiqi keçmişini öyrənmədən, bilmədən hansı tarix, dəyər üzərində həyatını davam etdirə bilər?

Zaman ötdükcə tarix dəyişir, öz dövrünə məxsus olanları "çiyinlərində" daşıya-daşıya keçmiş olur. Baxmayaraq ki, biz də həmin zamanlarda tarixin yanında oluruq, onu gündəlik həyatımızda yaşayırıq, lakin həmin yaşananları yazmasaq, arxivləşdirməsək, tarixləşdirməsək, olanlar da bizim kimi dünyasını dəyişib əbədiyyətə qovuşa bilər. Bu isə istənilən bir xalqın yaşadığı tarixi itirməsi ilə nəticələnər. Belə olan halda isə biz itirdiklərimizlə nə xalq, nə də millət ola bilərik. Odur ki, tarixi yaşatmağın bütün vasitələrindən istifadə etməklə buna nail olmalıyıq (Qaramalı, Aladdin, 2023).

Beləliklə, tarix və biz bir-birimizlə sıx əlaqədə olan iki maddi və mənəvi varlığıq. Tariximizi bilməriksə, deməli, yoxuq. Eləcə də tarix biz yoxuqsa, yaşanmasının nə mənası var... Ümumiyyətlə, insanlar və yaxud xalqlar öz tarixlərini yazmasa, bu işi başqaları istədiyi, bildiyi və öz xeyirləri, mənafeləri naminə yazacaqlar. Eyni zamanda tarixdən dərs alıb öyrənməyənlər, eyni şeyi təkrar yaşamağa məcburdur, məhkumdur. İrlandiyalı məşhur dramaturq, tənqidçi, "Nobel "mükafatı laureatı Corc Bernard Şou fikirlərinin birində qeyd edir ki, tarixdən götürüləcək dərs odur ki, insanlar tarixdən heç vaxt dərs götürmürlər . Sürətlə inkişaf edən, qloballaşan yaşadığımız bu dünyada digər şeylər kimi tarix də ortaq sərvətlərdən biridir. Ona görə də işlərimizi elə qurmalıyıq ki, bu menyudan daha çox pay götürə bilək, tarixi olmayan və buna görə də məhvə məhkum olanlardan olmayaq, bu günümüzü keçmişdən dərs alaraq quraq, gələcəyimizə doğru uğurla addımlaya bilək. İndiyədək yazılmış tariximizə nəzər saldıqda görürük ki, Azərbaycan tarixinin yazılmasında, əsasən, ərazi

prinsipi əsas götürülmüşdür və milli-etnik amil arxa plana keçirildiyindən tariximizin, mədəniyyətimizin bir çox qaranlıq qatlarına hələ də işıq salınmamış, xüsusilə xalqımızın yadellilərə qarşı milli azadlıq mübarizəsinin ən şərəfli, qürurverici səhifələri bağlı qalmışdır və bu proses hələ də davam edir.

Bununla yanaşı tarixçilər Azərbaycan adlı məmləkətin tarixinə toxunduqda əksər hallarda müasir Azərbaycan Respublikasının sərhədləri daxilində olan ərazilərdən kənarda qalan, tarixin müxtəlif aşamalarında işğal olunmuş qədim Azərbaycan torpaqları ilə bağlı hadisə və şəxsiyyətləri az qala tamamilə unutmuşlar. Minilliklər bundan öncə türk yurdu olan Azərbaycan xalqının böyük, şanlı dövlətçilik tarixi mövcud olmuşdur. Təəssüf ki, bir çox hallarda xalqımızın və dövlətimizin qorunmasında müstəsna xidmətləri olmuş soydaşlarımızın fəaliyyəti hər hansısa səbəbdən unudulmuşdur. Xalqımızın qəhrəmanlıq tarixinin belə unudulmuş şanlı, şərəfli səhifələrindən biri də tarixi torpaqlarımız olan və hal-hazırda quraşdırma "Ermənistanın-Hayıstanın" Vedibasar mahalında hay-daşnak quldur hərbi birləşmələrinin təcavüzünün qarşısını almaq məqsədilə Abbasqulu bəy Şadlinski tərəfindən yaradılmış Vedibasar özünümüdafiə dəstələrinin 1917-1920-ci illərdə apardığı şərəfli mübarizədir. Məlum olduğu kimi tarixdə heç bir vaxt dövləti, dövlət qurumu olmayan haylar Türkiyə, Azərbaycan, Gürcüstan torpaqları hesabına "Böyük Hayıstan" xülyalarını həyata keçirmək üçün XX əsrin əvvəlindən başlayaraq fəal təcavüzkar planlarını həyata keçirməyə başladılar. Bu planın əsas məqsədi Osmanlı-Qacarlar-Azərbaycan torpaqları arasında terorçu bir dövlət formalaşdırmaq olduğu üçün hay-daşnak hökümətinin İrəvan-Naxçıvan istiqamətindəki hücumları olduqca kəskin şəkil almağa başladı.

Bu heç də təsadüfi bir işğalçı addım deyildi. Çünki Naxçıvanı işğal etmək hayların planının əsas tərkib hissələrindən biri idi. Ancaq İrəvanla Naxçıvan arasında heç gözləmədikləri bir halda keçilməz bir sədd olan Vedibasar mahalı və onun istedadlı,qəhrəman sərkərdə, bütün ömrü boyu hay millətçilərinin qənimi olan Abbasqulu bəy Şadlinskinin komandanlıq etdiyi Vedibasar silahlı dəstələri dururdu. Quldur daşnaklar bu səddi yarmağa dəfələrlə riyakar, diplomatik, hiyləgər hərbi cəhdlər etsələr də heç bir uğur əldə edə bilmədilər və xeyli itkilər verərək geri çəkilməyə məcbur oldular. Abbasqulu bəy Şadlinskinin dünyagörüşü, düşüncəsi, hadisələrə qiymət vermək qabiliyyəti onu bir komandirə xas olan xüsusiyyətlərin fövqündə göstərirdi. O öz fəaliyyətini təkcə bir döyüşçü kimi yerinə yetirməkdə görmür, təkcə quldurlara qarşı müharibə aparmır, eyni zamanda on minlərlə dinc əhalinin təhlükəsizliyinin qayğısına qalır, hərbi silah, sursat azaldığı vaxtda dinc əhalini dəfələrlə bir kənddən digərinə, hətta Cənubi Azərbaycana köçürülməsini, təhlükə sovuşanda geri qaytarılmasını təmin etmişdir. Bütün bunlar onun müxtəlif hərbi-siyasi proseslərdə uğurla nəticələnən qərarlar qəbul etmə bacarığında olan rəhbər olduğunu birmənalı şəkildə sübut edir (Kommunist qəzeti, 1986).

Ümumtürk tarixində qədim tayfalardan biri olan Şadılı, Şadlı, Şadlinskilər sülaləsi haqqındakı rus mənbələrində qeyd edilir ki, bu sülalə XVII əsrdə yaşayan Binnətalı Sultan adlı bir şəxslə başlayıbdır. Ötən əsrin əvvələrindən başlayaraq Azərbaycanın ictimai-siyasi, hərbi, maarif və elm sahəsində xüsusi xidmətləri olmuş Şadlinskilər onun dörd oğlunun (Aslan Sultan, Kəlbalı Sultan, Niftalı Sultan, Bala Sultan Şadlinskinin) nəslindəndirlər. Yaşadıqları İrəvan quberniyasının Vedibasar mahalında Şadlinskilər həmişə tərəqqipərvər, maarifləndirici və mütərəqqi fikirləri ilə fərqləniblər. Bu sülalənin nümayəndələri xalqımızın haqq və ədalət uğrunda apardığı mübarizəsində ön sıralarda olublar. Bu nəslin kökü orta əsrlər Azərbaycan dövləti olan Şəddadilər dövlətinin qurucularından biri olan, bəlkə də, məhz özləri olan Şadlılar tayfası ilə bağlıdır. Gəncədə yaşayan şadlılar XIV əsrin axırlarında İrəvana köçüblər.

Bəzi tarixi mənbələrdə isə bu sülalənin tarixi haqqında olan məlumatlar onların tarixini daha qədimlərə aparıb çıxarır. Tarixi Vedibasar mahalında dünyaya gəlmiş görkəmli alim, professor Firudin Cəlilov qeyd edir ki, Şadılı tayfalarından bəhs edən tarixi qaynaqlar həm məkan, həm də zaman baxımından olduqca genişdir. Belə ki, ilk dəfə şumer mətnində şad sözü, Asur və Urartu qaynağında görünən şad, şadılı sözləri məkan baxımından Urmu gölü hövzəsi və İrəvan mahalına aiddirsə, sonrakı tarixi mənbələrdə şad sözünə Orxon abidələrində və Çin qaynaqlarında rast gəlmək olur. Vedibasar bölgəsində şadılı boyunun tarixi çox qədim çağlara aiddir. Urmu hövzəsində isə şatırlı tayfalarının tarixi miladdan öncə VIII əsrə aiddir. Belə ki, Şatir-araqa (Şatiraraya da oxunur) və Şatiru

adlı bölgələr barədə e.ə. 777-ci və 780-ci illərə aid urartu dilində yazılmış tarixi qaynaqlar vardır. Həmin ərazilərdə Şattera adlı bölgəni isə eyni əsrə aid asur qaynağı da təsdiq edir. Assur – Urartu mətnləri isə I minildə qeydə aldıqları şad titulu və şad, şadlı tayfalarından bəhs edir (İqor Mixayloviç Dyakanov-Urartu tarixi haqqında Aşşur-Babil qaynaqları, 1951. s. 10). Türkiyə tarixçilərinin əsərlərində də bu barədə tutarlı məlumatlar az deyildir.

Türkiyəli tədqiqatçı Professor Doktor Veli Saltık yazır: "935-ci ildə Şadılılar Araz və Kür çayları arasında, antik dövrdə "Antopatan"adlanan coğrafi bölgənin quzeyində yerləşən və daha sonra "Aran" adlanan bölgədə 951-1064-cü illərdə hökmdar olmaqla, 1174-cü ilə qədər bir dövlət qurdular" (mənbə; Saltik Veli "Sadiler ve Kockiriler", 2011).

Şadlı tayfası Qərbi Azərbaycan və Naxçıvan ərazisində yaşayıb və onlar Xəzər xaqanlığı dövründə bu böyük dövlətə tabe idilər. Türk soylu olan bu tayfa Xəzər xaqanın böyük oğlu və xaqanlığa namizəd olan vəlihədlərə xidmət edirdilər. O dövrdə isə böyük bir coğrafiyaya hökm edən Xəzər xaqanlığı ərəblərin hücumlarına qədər bura Şadlı torpaqları kimi olub və ərəblər bura gələndə onların yanında olan səlnaməçilərin qeydlərindən sonra bəzi ərəbdilli yazılı qaynaqlara Şadın ölkəsi kimi düşmüşdür. Şadılılar istər Xorasan bölgəsində, istər Türkiyədə və ya Suriyada yaşadıqları yerlərə və kəndlərə Şadılı adı vermişlər. Sonradan ərəblərin qeyd etdiyi kimi guya Şadlılar ulu babası Səədin ərəb kökənli olub və İmam Həsənin soyundandır, bunu fars qaynaqları yazıblar və çox təəssüf ki, Osmanlı tarixçiləri də ona inanıb yazıblar. Tarixçi alim, dostum, Azərbaycan tarix elmində ilk dəfə olaraq Urartuşünaslıq sahəsində geniş tədqiqatlar aparan Ramin Əlizadə yazır: "Biz tarixə nəzər salsaq, ərəb işğalından sonra regionda bir çox yerlərə ərəblərin hakim olmasını görə bilərik, lakin bu regionda hakimlərdən birinin Səəd olması haqqında istər yazılı qaynaqlarda, istərsə də numizmatik materiallarda məlumatlar yoxdur". Sonradan bu adlar bir az təhrif olunsa da "Şidli", "Şadılı", "Şatırlı", "Şəddadi" adlarını saxlamışlar (Sovet Naxçıvanı qəzeti, 1986).

İstər arxeoloji abidələri, yazılı qaynaqları, istərsə də numizmatik materialları araşdırarkən biz daha çox Şadlı sözünə rast gəlirik nəinki Şəddad. Şəddadilər Şadlı sözünün dil üslubuna görə yaranmış adıdır. Orijinalda Şadlı dövləti, rus-osmanlı-fars dilinə yazılanda şəddadi kimi yazılıb, bəlkə də, qəsdən edilib ki, Şadlı tayfasının qədim soyunu silsinlər tarixdən. Şəddadi "Şadlı" sözü ərəbcə "Şədd" kimi tələffüz olunmuşdur, "ad//at" isə ərəbcədə başqa dillərdən alınma sözlərə artırılan cəm şəkiçisidir. Çağdaş dövrdə maraqlandığımız və araşdırdığımız bəzi ölkələrin tarix kitablarında yazılan Şəddadilər adlı dövlət kürd dövləti deyil, orijinal, əsl adı Şadlı dövlətdir. Həmçinin qədim türk xalqıdır və Azərbaycan, xüsusilə Qərbi Azərbaycan ərazisində tarixən yaşayıblar. Dədə Qorqud dastanında adı qeyd edilən Bayandur xan da bu tayfaya aid olan şəxsiyyətlərdən biridir. Şəddadilər adı isə Şadlı adının sonradan yanlışlıqlamı, yoxsa bilərəkdənmi təhrif edilmiş formasıdır. Bu tayfanın türk olmasının ən böyük və tutarlı sübutu isə Orhon abidələrdir. Həmin tarixi abidədə konkret olaraq yazılıb ki, iki oğluma yabğu-şad adı verdim. Yeddi yüz kişini döyüşə aparanın böyüyü Şad idi. Bütün bu tarixi mənbələrdə olan məlumatların davamı olaraq qeyd edilməlidir ki, Şadlıların adı İrəvanla bağlı mühüm tarixi hadisələrdə də çəkilmişdir. Məsələn, bu qədim türk tayfasının ağsaqqallarından olan Aslan Sultan Şadlinski 1806-cı ildə Vedibasarın rəisi olmuşdur (Vedibasar qəzeti, 2007).

Rusiya-Qacarlar müharibəsinin getdiyi bir vaxtda Paskeviçin Aslan Sultanla görüşdüyü haqqında məlumatlar da tarixi mənbələrdə öz əksini tapmışdır. Rusiyanın Qafqaz qoşunlarının komandanı general İvan Paskeviçin çar I Nikolaya göndərdiyi məktubda da onun adı çəkilmişdir. Bütün bu faktların özü həmin dövrdə Aslan Sultan Şadlinskinin və onun təmsil etdiyi şadlı tayfasının bölgədə böyük nüfuz sahibi olmasını bir daha təsdiqləyir. Aslan Sultanın oğlu Hüseyn xan Şadlinski sonralar çar Rusiyasının ordusunda ləyaqətlə qulluq edib, rus-yapon müharibəsinin əsas döyüşlərindən olan Port-Arturun müdafiəsində iştirak edərək həmin dövrün ən yüksək təltifi olan "Müqəddəs Georgi" ordeninə layiq görülmüşdür. Aslan Sultanın bir neçə övladı olubdur. Vedibasar elinin böyük oğlu, xalq qəhrəmanı, hayların quldur dəstələrinə qarşı mübarizədə ad çıxarmış Abbasqulu bəy Şadlinski də məhz onun nəvəsidir. Bildiyimiz kimi, Azərbaycan çar Rusiyası tərəfindən işğal olunduqdan sonra İrəvan xanlığı da daxil olmaqla digər xanlıqlar ləğv edildi. 1886-cı ildə Vedibasarda ilk rus-müsəlman (türk tatar) məktəbi açılır və Abbasqulu bəy ilk təhsilini həmin məktəbdə alır. Abbasqulu bəy Xanbaba bəy oğlu Şadlinski 1886-cı ildə anadan olubdur. 1894-cü ildə anasının köməyi ilə Vedidə iki illik rus-tatar məktəbində oxumuş, lakin maddi çətinlik üzündən təhsilini davam etdirə

bilməmişdir. Atasının vaxtsız ölümü ona geniş təhsil almağa imkan vermir. 1902-ci ildə 15 yaşında olanda məktəbi tərk etməyə məcbur olur, çünki ikisinifli məktəbi qurtaran uşaqlar ya seminariyaya, ya da gimnaziyaya daxi olmalı idilər. Həmin məktəblərdə təhsil almağa imkanı çatmadığı üçün ailəsini dolandırmaq məsuliyyəti onu məcbur edir ki, atadan qalma torpaq sahəsini əkib-biçərək ailəsini dolandırsın. Mütərəqqi baxışları, haqqı, ədaləti qoruması, humanist və dəyişməz xarakterli olması ona camaat arasında dərin hörmət və nüfuz qazandırmışdı (Azərbaycan Gəncləri qəzeti, 1986).

Məhz bu səbəbdən 1912-ci ildə yerli əhalinin təkidiylə Abbasqulu bəyi mirab seçirlər. Onun gənclik illəri inqilablar, müharibələr dövrünə təsadüf edir. 1905-ci il birinci rus inqilabı, Qacarlar dövlətində baş verən Səttar xan hərəkatı da onun dünyagörüşünün formalaşmasında müəyyən rol oynamışdır. Birinci dünya müharibəsindən sonra Rusiya imperiyasında olduğu kimi Qafqazda da ictimai-siyasi böhran daha kəskinləşmişdir. 1917-ci ilin fevralında Rusiyada burjua-demokratik inqilabından sonra ucqarlarda millətçi partiyaların fəaliyyətlərini canlandırması, həmçinin xarici müdaxilə nəticəsində hər yerdə hərc-mərclik, özbaşınalıq, talançılıq hökm sürürdü. Xüsusilə amerikan-ingilis hərbi dairələri tərəfindən təpədən dırnağa silahlandırılmış hay quldur dəstələri Andronik, Dro, Bek Primov və Kazonun rəhbərliyi ilə Şərur, Zəngibasar və Vedibasarda dinc sakinlərə qarşı insanlığa sığmayan vəhşiliklər edirdilər. Belə bir şəraitdə siyasi və hərbi zərurətdən Abbasqulu bəy Şadlinskinin rəhbərliyi ilə keçirilən iclaslarda aparılan müzakirələrdən sonra qəti qərar qəbul edildi ki, Vedibasar Komitəsi adlı qurum yaradılsın. 1917-ci ildə Abbasqulu bəy Şadlinskinin başçılığı ilə 11 nəfər tərkibdən ibarət Vedibasar Komitəsi adlı Milli Hökumət və onun silahlı qüvvələri “Mübariz dəstə” məhz Böyük Vedidə yaradıldı və komitənin qərargahı buradakı ikimərtəbəli rus-tatar məktəbinin binasının bir hissəsində yerləşdirildi. Əslində bu həmin dövr üçün Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasına qədər mövcud olmuş ilk müstəqil milli dövlətçilik ənənələrimizin oyanışının müjdəçisi idi. Çox da uzaq olmayan bir tarixdə 1828-ci il Türkmənçay müqaviləsindən sonra İrandan və Türkiyədən Azərbaycan torpaqlarına kütləvi şəkildə köçürülüb xüsusilə İrəvan, Naxçıvan və Qarabağ xanlıqları ərazisində məskunlaşdırılan ermənilər tədricən bölgədə mövqelərini möhkəmlədib milli ayrı-seçkilik, separatçılıq fəaliyyəti ilə məşğul olur, tarixi şəraitin doğurduğu ilk fürsətdə – 1905-ci ildə isə torpağında məskunlaşıb çörəyindən yedikləri azərbaycanlılara qarşı soyqırımı həyata keçirirdilər. Bu soyqırımı 1917-1921-ci illərdə özünün kulminasiya nöqtəsinə qalxdı, bütün Cənubi Qafqazı, Şərqi Türkiyəni və Cənubi Azərbaycanı ağuşuna aldı. Belə bir ağır vəziyyətdə yerlərdə əhali öz təhlükəsizliyini təmin etmək, özünümüdafiə dəstələri yaratmaq barədə düşünməli olmuşdur.

Əvvəldə də qeyd edildiyi kimi İrəvan quberniyasının İrəvan qəzasının Vedi nahiyəsinin rəisi, 32 yaşlı Abbasqulu bəy Şadlinski də elə həmin vaxtlar Böyük Vedinin və ətraf kəndlərin igidlərindən silahlı dəstə yaratmağa başlamışdır. Xalq arasında böyük nüfuz sahibi olan Abbasqulu bəy az vaxtda bu işin öhdəsindən uğurla gəlir və həmin dəstə tezliklə “Mübariz dəstə” adı ilə məşhurlaşır. Abbasqulu bəy o tarixi şəxsiyyətlərdəndir ki, hələ sağlığında qəhrəmanlığına aşıqlar şeirlər qoşub, özünün və silahdaşlarının şəxsiyyəti və qəhrəmanlığı haqqında el arasında çoxlu rəvayətlər dolaşmışdır. Abbasqulu bəyin şəxsiyyət və qəhrəmanlığı da böyük bir ərazidə təsadüfən şöhrət tapmamışdır. Vedibasar Komitəsinin qərarına əsasən Abbasqulu bəy Şadlinski qısa vaxt ərzində elin igid oğullarını ətrafına yığaraq ilk özünümüdafiə dəstəsini yaratdı. Lakin bölgədə vəziyyət olduqca ağır idi. 1918-ci ilin ilk ayında İrəvan vilayətində daha da azğınlaşan daşnaklar Vedibasar mahalında da sabitliyi pozmağa başladılar. Silahlı hay daşnakların müsəlman kəndlərinə basqınları artıq sistemli şəkil almışdı. Hay ermənilər kəndlərə qəfildən hücum edir, dinc əhaliyə vəhşicəsinə divan tutur, onları qılıncdan keçirir, var-dövlətlərini talayıb aparır, evlərinə, mülklərinə od vurub yandırırdılar. Faciənin miqyasını təsəvvür etmək üçün belə bir faktı xatırlatmaq yetərincədir ki, İrəvan hadisələri o vaxt Zaqafqaziya Seyminin 5 fevral, 7 fevral, 19 fevral və 20 fevral 1918-ci il tarixli iclaslarında müzakirə olunmuş və Seym vəziyyətlə yerindəcə tanış olmaq üçün İrəvana nümayəndə heyətləri göndərmişdir. Baş verən faciənin əks-sədası olan hesabatlardan biri də A. Novatskinin rəhbərliyi ilə hadisə yerlərində olmuş Fövqəladə İstintaq Komissiyası tərəfindən hazırlanmış arayış-məlumatdır. Həmin arayışdan məlum olur ki, 1918-ci ilin martınadək İrəvan quberniyasının təkcə dörd – İrəvan, Sürməli, Üçmüədzin və Yeni Bayazid qəzalarında ermənilər 197 müsəlman kəndini dağıdıb, bu kəndlərdə yaşayan 135 min nəfərə qədər əhalinin əksəriyyətini qətlə yetirib, sağ qalanlar isə qaçıb

ətraf bölgələrə – Azərbaycan, İran və Türkiyənin müsəlman kəndlərinə sığınmışlar. Hay erməni terrorizmi bütün bölgəni bürümüşdü.

Azərbaycan Demokratik Cümhuriyyəti yarandıqdan sonra da bu fəlakətin qarşısını almaq mümkün olmamışdır. Deyilənlərdən aydın olur ki, bölgədə tarixi hərbi-siyasi vəziyyət son dərəcə ağır idi. Lakin hər zaman olduğu kimi bu dəfə də xalqın yetirdiyi bir qəhrəman vardı və belə bir tarixi vəziyyətdə bölgədə erməni faşizminin qarşısını kəsə bilən möhtəşəm bir qüvvə meydana atılmışdı ki, bu da Abbasqulu bəy Şadlinskinin başçılığı ilə yaradılmış Milli Hökumət və özünümüdafiə ordusu idi. Xalq bu hərəkatı, onun ordusunu və bu ordunun komandanını yekdilliklə qəbul etmiş, bütün mahalın əli silah tutanları bu orduya yazılmış, könüllü olaraq Abbasqulu bəyin sərəncamına keçmişdilər. Artıq xalq arasında Abbasqulu bəy haqqında rəvayətlər dolaşmaqda idi, hamı onun gülləbatmaz olduğuna inanırdı. Hamı onun ədalətinə, qəhrəmanlığına güvənir və sığınırdı. Abbasqulu bəy bu inamı orduda yaratdığı hərbi intizam və qanun-qayda ilə də qazanmışdı. Bütün qərarlar kollegial surətdə qəbul olunar, qəbul olunmuş qərar hamı üçün qanun olardı (Sovet Naxçıvanı qəzeti, 1986).

Bu qərarların icrasına o özü məsuliyyət daşıyardı, heç kəs qəbul olunmuş qərara qarşı çıxmağa, onun bir sözünü iki etməyə cəsarət etməzdi, cəsarət edənlər müharibə dövrünün qanunlarına uyğun olaraq dərhal və yerindəcə cəzalanardı. Hay-erməni daşnaklarına qarşı qəhrəmanlıqla döyüşənlər sırasında Abbasqulu bəy Şadlinski ilə yanaşı Xəlil Mehdiyev, Abbas Əjdərov, Müseyib Əhmədov, Muxtar İbrahimov, Məhərrəm Pənah oğlu, Ələkbər Sadıxov, İbrahim Fərzəliyev, Kərbəla İsmayıl, Əsəd İsmayıl oğlu, Kürd Sultan, Qəmbəralı İsmayıl oğlu (Qəmlo) kimi onlarla cəsarətli oğullar var idi. Yeni elan edilmiş qondarma Ararat hay-daşnak hökumətinin mərkəzinin yerləşdiyi İrəvan şəhərindən cəmi 30-35 km-lik məsafədə yerləşməyinə baxmayaraq ermənilər xeyli vaxt idi ki, Vedibasar mahalına soxulmağa cəsarət etmirdilər. Lakin Abbasqulu bəyin başçılıq etdiyi silahlı özünümüdafiə qüvvələrinin günü-gündən güclənməsi daşnak hökumətini artıq əməlli-başlı narahat etməyə başlamışdır. Vedibasar haylar üçün bir də ona görə təhlükə mənbəyi idi ki, bu mahal mühüm strateji nöqtədə – İrəvanla Naxçıvan arasında yerləşirdi. Bu da hayların Naxçıvanı Ermənistana birləşdirmək arzusuna ciddi maneçilik törədirdi. Halbuki daşnaklar belə hesab edirdilər ki, daşnak lideri H.Kaçaznuninin sözləri ilə desək, "tatar (türk) Şərur-Naxçıvanından ayrılıqda Ermənistan dövləti mövcud ola bilməz".. Digər tərəfdən Vedibasar mahalı həm də İrəvanla Dərələyəz-Zəngəzur mahalları arasında yerləşməklə hər iki istiqamətdə İrəvan-Dərələyəz və İrəvan-Naxçıvan cəmləşmiş hay-daşnak qüvvələrinin həlledici məqamlarda bir-birlərinə yaxınlaşmasına, birləşməsinə imkan vermirdi. Bunu nəzərə alan haylar 1918-1920-ci illərdə Vedibasar üzərinə bir neçə dəfə hücuma keçdilər, lakin hər dəfə də darmadağın edilirdilər.

Osmanlı ərazisində türklər tərəfindən məğlub olub Araz çayını keçərək Naxçıvana soxulmuş "Van" və "Sasun" hay-daşnak quldur alayları Andronikin əmri ilə 1918-ci ilin dekabr – 1919-cu ilin yanvar aylarında Vedibasarın Şahablı, Qədirli, Qaraxaç və digər kəndlərinə basqın edib burada misli görünməmiş vəhşiliklər törədir, dinc əhalini ayrı-ayrı binalara yığıb diri-diri yandırmışlar. Bu barədə məlumat alan kimi hadisə yerinə çatan Abbasqulu bəyin və Kərbəlayı İsmayılın dəstələri erməniləri xeyli tələfata uğradaraq kəndlərdən qovub çıxarırlar. Hər tərəfdə döyüş vəziyyəti olduğu bir vaxtda öz dövründə aşıq sənətinin görkəmli nümayəndələrindən biri olan Şahablı Aşıq Cəlil hay-daşnaklar tərəfindən əsir alınır, ondan "general" Andronikin şərəfinə oxumasını tələb edirlər (Andronik Ozanyanın heç bir hərbi təhsili olmadığı üçün rütbəsi də olmayıb. Osmanlı ordusunda siravi xidmət etdiyi dövrdə dövlətə xəyanət etdiyi aşkar edilmiş, həmin dövrdə vətənə xəyanət edənlərin qulağı və burnu kəsildiyi üçün onun da qulağı cəza olaraq kəsilmişdir) Aşıq Cəlil isə, əksinə, üzünü Böyük Vedi kəndi tərəfə tutub ermənilərə dəfələrlə qan udduran Abbasqulu bəyin şərəfinə, onu imdada çağıran qoşma oxuyur:

Vedinin dağları batıbdır yasa,
Andranik istəyir Vedini basa.
Bir namə yazmışam o xan Abbasa,
Yazmışam durmasın haraya gəlsin,
Yağı salıb bizi araya gəlsin!

Çat haraya, bəyim, nicat günüdür,
Vedinin davası, qeyrət günüdür!

Bu şeirdən sonra ermənilər elə oradaca aşığı yerə yıxıb dilini dibindən qoparır, sonra da üstünə neft töküb sazı ilə birgə gərmə qalağı içərisində diri-diri yandırırlar. Abbasqulu bəyin hərbi uğurları o vaxt Azərbaycan Demokratik Cümhuriyyətinin diqqət mərkəzində idi. 1919-cu ilin iyun-iyul aylarında daşnak hökumətinin polkovniki Aprosimovun başçılığı ilə Vedibasar mahalı üzərinə hücumu vedililər tərəfindən darmadağın ediləndə Azərbaycan Cümhuriyyətinin İrəvandakı nümayəndəsi Məhəmməd xan Təkinski buradan Bakıya AXC hökumətinə məlumat verərək böyük qürurla yazmışdır: "Böyük vedililər erməni polkunu tamamilə darmadağın etdilər və polk, demək olar ki, bütün heyətini itirmişdir". Bu məğlubiyyətdən sonra daşnak-hay hərbi komandanlığı Vedibasar üzərinə yeni hücum hazırlamaq və həyata keçirmək üçün quldurbaşı Droya xüsusi tapşırıq və hər cür səlahiyyət verir. Dro yaxşı təlim görmüş və silahlanmış nizami qoşunla yanaşı peşəkar daşnak mauzerçilərini də hücuma cəlb edir. O, tezliklə Vedibasar mahalına od vurub, Böyük Vedi kəndinin külünü göyə sovuracağı barədə daşnak hökumətinə söz verir.

Azərbaycan hökuməti daşnakların Vedibasara bu hücumunun qarşısını almaq üçün çox çalışır. Ararat Respublikasına rəsmi nota verir. Lakin, təbi ki, qarşı tərəf bu notanı rədd etmişdir. Bu zaman bölgədə ingilislər ağalıq etmək üçün haylardan istifadə edirdi. İngilislərin ayrı-ayrı strateji məntəqələrdə – Dəvəlidə,Yaycıda, Şahtaxtıda, Baş Noraşen stansiyasında hərbi düşərgələri var idi. Dəvəlidə dayanan ingilis komandanlığı Abbasqulu bəyi danışığa dəvət edir. Əvvəlcədən əldə edilmiş razılığa görə, danışıqlar qatarın vaqonunda aparılmalı idi. Lakin Abbasqulu bəy vaqona daxil olan kimi qapılar bağlanılır və qatar İrəvana tərəf yola düşür. Abbasqulu bəy ingilislər tərəfindən oyuna gətirildiyini anlasa da artıq gec idi. Ancaq öz soyuqqanlığını qoruyaraq prosesin gedişatını gözləməli oldu. İngilis komandanlığı İrəvanda Abbasqulu bəyi daşnaklara təslim edir. O burada həbs ediləndə Bakıdan Məhəmməd xan Təkinskiyə teleqramlar vurulur ki, bütün vasitələrdən istifadə et, təcili olaraq Abbasqulu bəyin azadlığa çıxması üçün əlindən gələni əsirgəmə. Hətta sovet hakimiyyətinin ilk ilində Naxçıvan erməni işğalı təhlükəsi altında qalanda da Nəriman Nərimanov Naxçıvanın o vaxtkı Hərbi İnqilab Komitəsinin sədri Bahadur Vəlibəyova teleqram vuraraq təkid edir ki, təcili Abbasqulu bəy Şadlinski Arazın o tayından (Abbasqulu bəy 1920-ci ilin iyulundan sonra Güney Azərbaycana mühacirət etmişdi) Naxçıvana dəvət edilsin və ona daşnaklara qarşı mübarizədə hər cür şərait yaradılsın. Daşnaklar Abbasqulu bəyə belə ultimatum verir ki, "əgər gedib bütün Vedi əhalisində olan silahların təhvil verilməsini təmin etməsən, öldürüləcəksən". Belə bir çətin situasiya qarşısında qalan Abbasqulu bəy peşəkar diplomatik qabiliyyət nümayiş etdirir (Sovet Naxçıvanı qəzeti, 1986).

O bildirir ki, silah əhalinin özünə məxsusdur və bunu toplamaq çətin olduğu üçün bunu müəyyən bir vaxt ərzində etmək mümkündür. Danışıqlar zamanı daşnakları inandıran Abbasqulu bəyi İrəvanın nüfuzlu adamlarından olan Əli Abbasov, Hüseyn bəy və Cavanşir bəyin zəmanəti ilə buraxırlar. Vediyə qayıdan A.Şadlınski daşnak rəhbərlərinin verdiyi tələbləri rədd edir və müdafiəni yenidən gücləndirir. Onu zamına götürən Əli Abbasov və Cavanşir bəy gizli yollarla Bakıya gedirlər, Hüseyn bəy isə Dronun əmri ilə həbs edilsə də oradan çıxıb qaçmağı bacarır. Əslində tarixi şəxsiyyət olması və hay-daşnak işğalçılarına qarşı apardığı milli azadlıq mübarizəsinin xarakteri baxımından da Abbasqulu bəy tam bir xalq qəhrəmanıdır. Elin ən ağır günlərində silaha sarılıb at belinə qalxan Abbasqulu bəy qısa vaxtda böyük bir mübarizlər dəstəsi yaradır, təkcə Vedibasar mahalında yox, bütün İrəvan çuxurunda, Dərələyəzdə, Şərurda qəhrəmanlığı ilə ad çıxarır, onun dəstəsinə yaxın-uzaq ellərdən igidlər axışıb gəlir, Abbasqulu bəy bütün döyüşlərdən qələbə ilə çıxır və bu əlamətlər onu əfsanəvi qəhrəmana çevirir.

**İgid ölər, adı qalar. Abbasqulu bəy Şadlinski 1918-1920-ci illərdə**

Ermənilərin Vedibasara mütləq hücum edəcəklərini bilən Abbasqulu bəy təcili olaraq müdafiə işlərinin təşkilinə başlayır. 1918-ci il mayın 18-də qərargahda iclas keçirilərkən Nəcəfqulu adlı bir şəxs içəri daxil olur və Milli dairənin komandiri Cahanbaxış bəyin məktubunu Abbasqulu bəyə təqdim edir. Abbasqulu bəy məktubu ucadan oxudu. Başkərnidən daşnak Artuşun quldur dəstəsi milli dərə kəndlərinə basqın edib, Almərdan, Ayburt,Yellicə kəndlərini qarət edən ermənilər əhalinin mal-qarasını süpürüb aparıb evlərinə od vurub yandırıblar. Əhali Kolaysora tərəfə üz tutub, biz 30-40

nəfərlik atlı dəstəsi daşnak quldurlarına qarşı vuruşmalıyıq. Abbasqulu bəydən lazımi göstəriş alan bölük komandirləri gecikmədən atlarına minib öz hissələrinə çapırlar. Abbasqulu bəy Çimən kəndi ilə əlaqə saxlayır, Sultan xana Kotuz dağı tərəfindən milli dərə istiqamətində hərəkət etmələri barədə göstəriş verir. Abbasqulu bəyin süvari dəstəsi gecikmədən Şorbulaq dağının yolu ilə Yoşannı düzə qalxır, İlani dağ qarşısına çatanda burada Abbasqulu bəy Kərnibasardan Seyidkotanlı kəndinə sarı irəliləyib böyük Vedi ilə milli dərə kəndlərinin əlaqəsini kəsmək istəyən daşnak qoşun hissələrinin üstünə çıxır. Şiddətli döyüş başlanılır, düşmən qoşunları duruş gətirə bilməyib qaçmağa başlayırlar. Mübariz dəstənin başqa silahlı bölükləri, o cümlədən Hacı Mirzə tərəfdən Sultan xanın və Mirzə oğlu Həbibin dəstələri də köməyə çağrılır. Düşmən xeyli tələfat verir, əsas döyüşlər millidərə cəbhəsində gedirdi. Cahanbaxış bəyin igid döyüşçüləri az qüvvə ilə inadla müqavimət göstərirdilər. Qüvvələri tükənsə də döyüşə-döyüşə ermənilərin ön mövqelərinə lap yaxınlaşmışdılar, döyüşün belə ağır vaxtlarında Abbasqulu bəyin dəstəsi özünü yetirib döyüşə atıldı, ermənilər itki verə-verə qaçmağa başladılar. 1918-ci ilin mayın sonlarında ermənilərin böyük Vedi üzərinə birinci hücumu başladı. Kəşfiyyatın məlumatlarına görə daşnaklar əsas qüvvələrini İrəvana gətirib Qəmərlidə toplamaqda idilər, Abbasqulu bəy təcili olaraq əks tədbirlər görməyə, bütün istiqamətlərdə istehkamlar qurmağa, silahlı dəstələr yerləşdirməyə başladı. Kəndin şimal və şərq tərəfləri daha təhlükəli olduğundan Abbasqulu bəy Sultan xanın, Mirzə oğlu Həbibin və Kərbəlayı Museyibin başçılıq etdiyi əsas ehtiyyat bölüklərini əvvəlcədən bu istiqamətlərdə yerləşdirdi.

Onun şəxsi əmri olmadan mövqelərdən tərpənməməyi tapşırdı. Havanın tamam qaraldığını görən Abbasqulu bəy bu ehtiyyat dəstələrə mövqelərindən çıxaraq Şorbulaq istiqamətində qəti hücuma keçməyi əmr etdi. Kərbəlayi İsmayılın silahlı dəstəsi də həmin cəbhədə daşnaklara qarşı hücuma atıldı. Qələbürücdə möhkəm dayanan düşmənə ciddi müqavimət göstərən, onlara böyük Vedinin içərilərinə irəliləməyə imkan verməyən Abbasqulu bəy özü isə dəstəsini ermənilərin üzərinə əks hücuma apardı. Erməni quldurları vahiməyə düşərək qaçmağa başladılar, bu hadisədən sonra qudurmuş erməni daşnak hökuməti Abbasqulu bəy Şadlinski barədə qiyabi ölüm hökmü çıxardı. Abbasqulu bəy Şadlinski mübarizəsi təkcə Vedibasarla məhdudlaşmır, bütün ətraf bölgələri də əhatə edirdi. O, tez-tez ətraf vilayətlərin bəyləri, ağsaqqalları ilə görüşür, onlarla məsləhətləşirdi. Təbii ki, onlarda Abbasqulu bəydən heçnəyi əsirgəmir, bütün vasitələrlə onun mübariz dəstəsinə yardımçı olurdular. Belə el ağsaqqallarından biri də Batman qılınc seyidləri nəslinin nümayəndəsi Qəmərlinin yuxarı Ağbaslı kəndinin sayılıb seçilən bəyi Hacı Həsən Alı idi. Abbasqulu bəyin mübariz dəstəsinə də müxtəlif yollarla ərzaq , hərbi sursat yardımı edirdi. Onun oğlu Həbib, nəvələri Əbülfəz və Abdulla da Abbasqulu bəyin dəstəsində vuruşdular. Nüfuzlu Mirzəxanlı bəyləri də Abbasqulu bəyi dəstəkləyirdilər. Naxçıvandan qovulub çıxarılan Andranikin qoşunları tez-tez ətraf bölgələrə hücum edir, qarətlər törədirdilər. Hadisələrdən biri də Keşişdağ kəndində baş vermişdir. Faciənin canlı şahidi Musa Sətdar oğlunun xatirələrində bu barədə belə yazılıb: “1918-ci ilin yayı idi. Biz Keşişdağ kəndində yaşayırdıq, bir gün ermənilər iclas keçirmək adı ilə camaatı bir yerə toplayıb hamısını güllələyib öldürürdülər.Yaralı atamın təkidi ilə mən evin arxa pəncərəsindən qaçıb Çimən kəndə Kərbəlayi İsmayıla xəbər apara bildim. Çox keçmədi ki, Kərbəlayi İsmayılın dəstəsi yel kimi özlərini Keşişdağa yetirdilər. Bir qədər sonra Abbasqulu bəyin dəstəsi də özünü yetirdi (Aydınlıq qəzeti, 1991).

Həmin gün yüzlərlə erməni quldurları məhv edildi. 47 nəfəri isə əsir götürüldü, ermənilərin sətaruşahı nəslindən öldürdükləri 27 nəfərin qisası olaraq Musa Sətdar oğlu 27 erməni quldurunu xəncərindən keçirdi, elə o gündən Musa Sətdar oğlu mübariz dəstəyə qoşulub onun fəal üzvlərindən birinə çevrildi. Sonradan qırmızı taborda səhra komandiri vəzifəsinə təyin edildi. 1918-ci ilin iyul ayında Vedi ətrafında olan Aydoğmaz, Dəvəli, Şəfəqli kəndlərinin arasında 17 nəfər hay-daşnak mauzerçisi məhv edilibdir. Hay-daşnak rəhbərliyi Vediyə ultimatum göndərir ki, öldürülən mauzerçilərin hər birinə görə 17 min manat pul verilməli və 17 nəfər türk verilməlidir ki, onların qəbirlərinin üstündə başı kəsilsin. Abbasqulu bəy, təbii ki, bu təklifi rədd edir və əhaliyə müraciət edərək deyir: “Əgər əli silah tutan qabağa çıxıb döyüşməsə, bütün əhali məhv olacaqdır”. Bütün Vedi igidləri silaha sarılıb Dro, Dəli Kazo və Bek Primovun alayına qarşı döyüşə atılırlar. Vedi ətrafında bütün gün boyu davam edən qızğın döyüşlərdə Abbasqulu bəy daim ön sıralarda döyüşərək silahdaşlarını ruhlandırırdı. Onun seçdiyi döyüş taktikasına uyğun olaraq gecə sürətli hücumla

düşmənə ağır zərbələr vurulmağa başlanıldı. Düşmən qüvvələri sayca bir neçə dəfə çox olsalar da qaçırdılar. Hətta hay-daşnak mauzerçiləri öz yoldaşlarını tapdalayıb qaçırdılar. Düşməndən hərbi qənimət olaraq döyüş meydanında bir neçə top, 8 pulemyot, çoxlu miqdarda silah-sursat və patron əldə edilir. Bu döyüşlərdə xeyli sayda quldur və onların bir neçə komandirləri məhv edilir. Abbasqulu bəyin istedadlı, rəşadətli sərkərdə kimi nüfuzu bütün mahala yayılmışdı. Vedinin ətrafında olan Çəmənkənd, Çığındərəsi kəndlərinin igidləri Fərəməz Mahmudbəyov, Əli Eyvazov, İbrahim Fərzəliyev, Ələsgər Kərimov, Yetim Əlioğlu, Xəlil və başqaları buraya yığışmışdılar. Onların hər biri xalqı üçün canından keçən vətənpərvər, mərd və əsl cəngavərlər idilər. Vedidə gedən döyüşlər zamanı daşnaklar başqa kəndlərə qəfil hücumlar edir, günahsız insanları qətlə yetirirdilər. Həmin vaxt Dərələyəzdə, Küvəkənddə yaradılmış özünümüdafiə dəstəsinə Balo Vəkilov başçılıq edirdi. Dəstənin başçısı kimi döş pulemyotu ilə düşmənin üzərinə atılaraq yoldaşlarını ruhlandırırdı. Həddindən artıq özünə güvənən daşnak Yabonun dəstəsi darmadağın edildi.

Bu döyüşlərdə Balo ilə bərabər Yusif Seyidovun da göstərdiyi sücaət nəsillərə örnək ola biləcək bir qəhrəmanlıq nümunəsi idi. Yaxşı təşkil olunmuş özünümüdafiə döyüş xətti Şərur mahalının Yaycı kəndinədək uzanırdı. Məğlubiyyətin acısını çıxmaq üçün 1918-ci ilin payızında daşnak Yabo yaxşı silahlanmış quldur alayı ilə Yaycı kəndini mühasirəyə alır. Müdafiənin təşkilində və ön cərgədə cəsur döyüşçülərdən Kərim, Rəhim, Xərda Əli, Kalban Novruzun oğlu Əli, Fərəc Hüseyn oğlu, Süleyman, Məmmədhəsən uşaqları və başqaları dayanırdılar. Yüksək döyüş əhval-ruhiyyəsi ilə döyüşə atılan kəndin igid oğullarının qəhrəmanlığı ilə səhərdən-axşama qədər davam edən döyüşlərdə daşnaklar tərəfindən Cənnət qayası adlanan səngərə 21 top mərmisi atılır. Lakin heç biri hədəfə dəymir. Daşnakların mühasirə dairəsi o qədər geniş idi ki, Şərurdan köməyə gələn uşaqlar kəndə daxil ola bilmədilər. Nəhayət axşama yaxın məğlubiyyətə uğrayan daşnaklar geri çəkilməyə başlayır. Şərurdan köməyə gələn Zeyvəli Məmmədrza və Fətullanın dəstəsinin köməkliyi ilə düşməni Xaçik kəndinə çəkilməyə məcbur edirlər. Bu döyüşlərdə daşnak Yabonun dəstəsi xeyli itki versə də, kənd əhalisindən cəmi 3 nəfər yaralanmışdı. Yaycı məğlubiyyətinin qisasını almaq üçün daşnaklar Ənovu kəndinə hiyləgərliklə daxil olub əhalini inandırırlar ki, silahı yerə qoysalar, onlara heç bir zərər dəyməyəcəkdir. Lakin əhalinin silahı yerə qoymasından istifadə edərək 200 nəfərdən çox qadın, uşaq, qocanı öldürüb quyulara atırlar... Zəngəzur, Naxçıvan, Dərələyəz əyalətlərində hayların törətdikləri vəhşiliklərin sayı günü-gündən artır, hər obadan faciəli xəbərlər gəlirdi. Silahsız əhaliyə divan tutmaqla özünü "məğlubedilməz" hesab edən Hay-daşnak hökümətinin daxili işlər nazirinin köməkçisi yenidən böyük qoşunla 1919-cu il iyul ayının 4-də Vediyə hücuma keçdilər.

Döyüşün birinci mərhələsində daşnaklar 42 nəfər sıravi quldur, 1 nəfər quldur zabit, 400 ədəd tüfəng, 4 ədəd pulemyot itirərək qaçmağa başladılar. Məğlubiyyətlə barışmayan Dro qoşununu ən sərrast atıcalarla nizamlayıb yenidən hücuma keçdi. Vedi özünümüdafiə taborunun komandiri Abbasqulu bəy Şadlinski sərkərdəlik məharətini bir daha göstərdi. Əvvəlcədən qurulmuş plana uyğun olaraq daşnak qoşunları kəndin içərisində qarşılandı. Dro və digər daşnak komandirlər elə hesab etdilər ki, Abbasqulu bəyin dəstəsi kəndi tərk edib. Lakin daşnakların kəndin ortasına çatması ilə igid komandirin atəş əmri verildi. Düşmənin silah-sursat baxımından və sayca çox olmasına baxmayaraq düşmənə nifrət hissi ilə döyüşə atılan Vedililər son dərəcə cəsarətlə döyüşürdülər. Böyükdən kiçiyə hər kəs döyüşürdü. Əlbəyaxa gedən döyüşlərdə silahı olmayan kənd sakinləri balta və yaba ilə döyüşürdülər. Dörd saata qədər davam edən əlbəyaxa döyüşlərdə 1000 nəfərdən çox quldur itirən haylar xeyli silah-sursatı atıb qaçdılar. Qələbənin xəbəri geniş əks-səda doğurub bütün mahala yayıldı. "Dənizdən-dənizə" dövlət yaratmaq xülyası ilə hər cür vəhşiliyə əl atan daşnaklar Andronikin başçılığı ilə 1919-cu il iyul ayının 18-də yenidən hücuma keçir və Cıdırlıq bağ adlı yerdə 3 gün davam edən əlbəyaxa döyüşlər əhalinin qələbəsi ilə başa çatır. Məğlub olan daşnaklar Əbrəqunis-Paradaş-Nəsirvaz yolu ilə Qapıcıqdan aşıb Sisyanda mövqe tuturlar. Sisyan əhalisinə və Qaraxaç kəndində yaşayan dinc sakinlərə misli görünməmiş vəhşiliklər edərək əhalini qılıncdan keçirirlər. Bununla kifayətlənməyən quldur daşnak Andronik Vediyə bir neçə rota göndərir. Bu dəfə də Abbasqulu bəyin başçılığı ilə Vedi müdafiəçiləri Andronikin quldurlarını darmadağın edib çoxlu hərbi qənimət əldə edirlər.

Abbasqulu bəy Şadlinskinin Vedidə başlatdığı milli müqavimət hərəkatı bütün Qərbi Azərbaycan və Naxçıvanı əhatə etmişdi. Onun apardığı mübarizənin ideoloji əsası da təsirli olmuşdur. Belə

olmasaydı onun çıxışları, ayrı-ayrı mahallara göndərdiyi məktubların təsiri olmazdı. Abbasqulu bəyin çağırışı yerli əhalidə özünə inam hissini gücləndirdi. Qeyd etmək lazımdır ki, bu dövrdə əhali dilemma (insanın istəmədiyi halda hər iki seçimdə seçilən qərarın düzgün olmamasına baxmayaraq qarşılaşdıqda onlardan birini etməyə məcbur edən hərbi, siyasi vəziyyət, yaxud tərəflər arasında bir-birinə nəzərən daha çox təhlükəsizliyə gətirib çıxaran rəqabəti ifadə edən paradoks) qarşısında qalmışdı. Yerli türk-müsəlman əhalinin apardığı mübarizə nə qədər inadlı olsa da, daşnakların arxasında duran qüvvələr güclü hərbi, siyasi, maliyyə dəstəyi ilə qüvvələr nisbətini bir neçə dəfə artırırdı. Vəziyyəti dəyişmək üçün AXC hökuməti özünün 1919-cu il 28 fevral tarixli qərarı ilə Naxçıvan general-qubernatorluğunu (daha doğrusu, arxiv sənədlərində "Cənub-Qərbi Azərbaycan general-qubernatorluğu, habelə Naxçıvan, Ordubad, Şərur-Dərələyəz və Vedibasar rayonlarının müvəqqəti general-qubernatorluğu" adlanan) yaratdı. Ancaq bütün bunlar mövcud vəziyyəti dəyişə bilmədiyi üçün Abbasqulu bəy qüvvələrinin tükəndiyini nəzərə alaraq dinc əhalini xilas etmək üçün döyüşə-döyüşə geri çəkilmək əmri verdi (Vətən Səsi qəzeti, 1994).

Daşnakların vəhşiliyi heç bir insanlığa sığmayacaq dərəcədə faciəvi idi. Daşnakların nəinki qırğınlar törətdikləri kəndlərdə, eyni zamanda nəzarətə keçirdikləri ərazilərdə də hər şeyi viran qoyurdular. Onların istəklərini yerinə yetirməyən öz "soy"daşlarına qarşı da son dərəcə amansız idilər. "Terroristin vətəni, milləti yoxdur" ifadəsini onlar dəfələrlə öz hərəkətləri ilə (1988-ci il fevralın 28-də SSRİ DTK-nin hay millətçiləri ilə birgə həyata keçirdikləri təxribatlar məhz bu qəbildən olan və siyasi məqsədlərə hesablanmış terror hadisəsi idi) təsdiqləmişlər. Daşnakların 1918-22-ci illərdəki vəhşilikləri ilə bağlı Hayıstan-ermənistan KP Mərkəzi Komitəsinin birinci katibi olmuş C.A.Tovmasyan yazmışdı: "1919-cu ildə təkcə İrəvanda 9055 nəfər ölmüş, 20 minə yaxın insan səpmə-yatalaq xəstəliyinə tutulmuş, 6 mindən çox insan acından ölmüşdür. Sürməli və Üçmüədzin qəzalarında əhalinin 70 faizdən çoxu daşnakların hökmranlığı dövründə məhv edilmişdir". (mənbə: C. A. Tovmasyan "Sovet Ermənistanının 40 illiyi", 1960, s. 11).

Daşnaklar təkcə "Ararat" adlandırdıqları ərazilərdə deyil, başqa mahallarda da törətdikləri ağır cinayətləri nəticəsində İrəvan quberniyasında 211 kənd dağıdılmış, Qars vilayətində isə 92 kənd dağıdılmış, yandırılmış, talan edilmişdir. İrəvan və ətrafında 1920 ev yandırılmış 400 min nəfərə yaxın əhalidən ancaq 70 minə yaxın insan sağ qalmışdır. Zəngibasarda 48, Vedibasarda 118, Dərələyəzdə 74, Şərurda 76 kənd yandırılmış, yarım milyondan çox əhali öldürülmüş və didərgin salınmışdır. Hətta daşnak hökumətinin başçısı Hövhannes Kaçaznuni həyasızcasına etiraf etmişdi ki, (1920-ci ildə bolşeviklər tərəfindən həbs edilmişdir) "biz Ağbaba kimi maldarlıq rayonunu, Şərur kimi taxıl mənbəyini, Vedibasar kimi bağlı-bostanlı, meyvəli kəndləri darmadağın etdik"…

Abbasqulu bəy Şadlinskinin məqsədi döyüşə-döyüşə geri çəkilərək Şərura gəlib orada birləşib düşmənlə döyüşmək idi. Ancaq onlar Şərura çatanda gördülər ki, əhali buranı tərk edibdir, Küvə və Yaycı kəndinin sakinləri isə Şahtaxtıya tərəf çəkilibdir. Dinc əhalinin təhlükəsizliyini qorumaq məqsədi ilə (20 minə yaxın) başda Abbasqulu bəy, oğlanları İsgəndər, İsfəndiyar, Əliəşrəf olmaqla vedililər Qacarlar dövlətinin Xoy şəhərinə tərəf hərəkət edirlər. Abbasqulu bəyin Xoy şəhərinə yaxınlaşmasını bilən Xoy valisi Əbülhəsən xan dərhal Abbasqulu bəy Şadlinskiyə silahları təhvil vermək barədə xabardarlıq edir. A. Şadlinski valinin təklifini rədd edir və bildirir ki, biz buraya müvəqqəti gəlmişik, tezliklə vətənimizə qayıdacağıq. Xoy valisinin Abbasqulu bəyi qonaq çağırıb hiyləgərcəsinə silahları almaq niyyəti də baş tutmadı. Xoy valisi ilə münasibətlərin gərginliyini görən Abbasqulu bəy Mərənd şəhərinə tərəf hərəkət etdi. Bundan xəbər tutan Mərənd valisi Abbasqulu bəyə təklif edir ki, öz əhalisi ilə burada qalsın. Eyni zamanda ona yüksək rütbə verilərək vəzifə və mülk veriləcəyi barədə Mərənd valisi təminat verdi. A. Şadlinski valinin təklifinə hörmətlə ysanaşaraq qeyd edir ki, bura da türk yurdudur, burada yaşayanlar da doğma soydaşlarımızdır. Ancaq hər kəsə doğulduğu doğma yurdu daha əzizdir. Biz gec-tez göz açıb böyüdüyümüz doğma yurdlarımıza qayıdacağıq…

**Mübariz dəstə Qırmızı tabor kimi…**

1920-ci il aprelin 28-də Azərbaycanda qurulan Sovet hökuməti, bütün Azərbaycan torpaqlarında öz hakimiyyətini bərqərar etməli idi. Qarabağda vəziyyətə nəzarəti ələ keçirən XI Qızıl Ordunun 32-ci diviziyasından bir polk (alay) Studenyev və Petiovun başçılığı ilə Naxçıvana doğru hərəkət etdi. Zəngəzurda daşnak Njdenin başçılıq etdiyi dəstələri darmadağın edərək Əngəlöyə çatdılar. Burada

onları Naxçıvan nümayəndələri Əli Abbasov, Mirzə Əbdüləzim qarşıladı və Batabatdan aşıb Naxçıvana tərəf istiqamət aldılar. Polkun-alayın bir hissəsi Keçəldağdan aşıb Kükü yolu ilə Cəhri kəndinə gəldilər. Polkun o biri hissəsi isə Kolanı Qaçaq Mirzə başda olmaqla təntənəli surətdə qarşılandılar. Burada birləşmiş qüvvələr 1920-ci ilin iyulun 28-də Naxçıvana daxil olaraq Naxçıvanda Sovet hakimiyyətinin qurulduğunun elan etdilər. Bu vaxt daşnak qoşunları Əznəbürd, Xok, Şahtaxtı düşərgələrində mövqe tutmuşdular. Lakin onları tamamilə darmadağın edib ölkədən qovmaq üçün burada olan Qızıl ordunun qüvvələri yetərsiz idi. 1920-ci ilin avqust ayında Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri N. Nərimanov Bahadur Vəlibəyovun tabeliyinə 300 nəfərlik süvari qoşun hissəsi verərək Naxçıvana Fövqəladə Komissar təyin edir. Naxçıvana gələn B. Vəlibəyov burada Naxçıvan İnqilab Komitəsinin rəhbərləri Mirzəli bəy Bektaşov, Abbas Qədimov, Fərəməz Mahmudbəyov, Qafar Babayev və başqaları ilə mövcud vəziyyəti geniş müzakirə etdikdən sonra qərara gəldilər ki, Abbasqulu bəyi öz mübariz dəstəsi ilə birlikdə Naxçıvana dəvət etsinlər. Beləliklə, Naxçıvan İnqilab Komitəsi və Fövqəladə Komissarlıq adından göndərilən rəsmi nümayəndələr Seyfulla Süleymanov və Məmməd Rəhimov 1920-ci ilin sentyabr ayında Qacarlar dövlətinin Mərənd vilayətində düşərgə salmış Abbasqulu bəyin yanına gəlirlər. Bu barədə mübariz dəstənin döyüşçüsü olmuş Bilas Şadlinski yazır: "Sentyabr ayının axırları idi. Hər yerə xəbər yayıldı ki, Naxçıvan İnqilab Komitəsi adından Abbasqulu bəyə məktub gətiriblər. Məktub gətirənin biri Böyük Vedidən olan Seyfulla Süleymanov idi. Mərənd vilayətində ayrı-ayrı kənd və qəsəbələrdə yerləşdirilmiş qaçqın əhalinin nüfuzlu nümayəndələri dərhal Mərənd şəhərinə toplaşdılar. Abbasqulu bəy hamıya müraciətlə bildirdi: "Həm öz tərəfimdən, həm də bütün Qacarlar dövləti torpağında yaşayan soydaşlarımızın adından Naxçıvan İnqilab Komitəsinin və Naxçıvan Vilayət Şura hökumətinin dəvətini səmimiyyətlə qəbul etdiyimi bildirməklə tezliklə öz qüvvələrimizi Naxçıvna köməyə gələn Qızıl Ordunun ixtiyarına verəcəyimizə və onlarla birlikdə ümumi insanlığa düşmən olan, soydaşlarımıza qarşı qətliamlar törətmiş, yurdumuzu talan etmiş daşnaklara qarşı döyüşlərdə birgə iştirak edəcəyimizə söz vermişəm. Hamınız 2-3 gün müddətinə tam hazır olun, birlikdə Naxçıvana yola düşüb yurdumuzu azad edək". İzdihama toplaşan mübarizlərin hamısı vətənə dönəcəkləri xəbərini sevinclə qarşıladılar və bildirdilər ki, Abbasqulu bəyin əmri altında bütün tapşırıqları canla-başla yerinə yetirəcəyik. Mən də tez yaşadığım Hecovan kəndinə gəlib yol tədarükünə başladım".

1920-ci il sentyabr ayının 17-də Abbasqulu bəyin 400 nəfərlik silahlı dəstəsi Araz çayını keçərək Naxçıvana gəldi. Naxçıvan qəzasının Araz çayı sahilindəki sərhəd postunda Naxçıvanın Fövqəladə Komissarı Bahadur Vəlibəyov, XI Qızıl Ordunun bölmə komandirləri və Naxçıvan İnqilab Komitəsinin məsul rəhbərləri Abbasqulu bəyin dəstəsini hörmətlə qarşıladılar. Naxçıvanda keçirilən iclasda Naxçıvan İnqilab Komitəsinin qərarı ilə Mübariz dəstəyə "Qırmızı Tabor" adı verildi və Abbasqulu bəy Şadlinski taborun komandiri təyin olundu. Qızıl Ordunun 200 nəfərlik dəstəsi də taborun tərkibinə daxil edildi. 1920-ci il oktyabr ayının axırlarında "Qırmızı Tabor"un qarşısında Əznəbürd-Qarabağlar istiqamətində dağ ətəkləri ilə hərəkətə keçib Bağırsaqdərə-Sədərək arasında mövqe tutmaq, Arazdəyən-Çapaxçı istiqamətində irəliləyən Qızıl Ordu hissələri ilə birləşmək vəzifəsi qoyuldu. Noyabr ayı ərzində davam edən əməliyyatlarda Şahtaxtı və Xok kəndlərində 1200 daşnak əsgəri və zabiti əsir alındı, xeyli silah-sursat qənimət kimi ələ keçirildi. Dekabrın 2-də Şərur qəzası daşnaklardan tam azad edildi və orada inqilab komitəsi təşkil olundu. 1921-ci ilin yanvar və feral aylarında "Qırmızı tabor"a tapşırıq verildi ki, daşnak Yabonun başçılığı altında Dərələyəzdə Şərur-Qəmərli istiqamətlərində başlanan təhlükəli hücumun qarşısı alınsın, quldur dəstə məhv edilsin. Təcrübəli sərkərdə Abbasqulu bəy Şərura gedən yolda, Danzik və Arazdəyən istiqamətində, Zəncirli-Canaxçı kəndlərində yerləşərək düşmənin qarşısında keçilməz sədd yaratdı. Bu döyüşlərin igid döyüşçülərindən biri olan Məmmədov Həsən yazır ki, "Xənpanent Yobanın Şəhriyar-Sədərəkdə irəliləyərək Ağrı (Ararat) çölünə çatmaq istəyən dəstəsinə elə bir zərbə vurduq ki, özlərini itirən daşnaklar pərakəndə halda Dərələyəz tərəfə qaçmağa başladılar. Abbasqulu bəy əmr etdi ki, onları təqib edib güc toplamadan ilanın başını tamam əzməliyik. Komandirin ağıllı və cəsarətli planları, şəxsi qəhrəmanlıq nümunəsi bu ağır döyüşdə də köməyimizə çatdı. Quldur daşnak X. Yabonun dəstəsi tamamilə məhv edildi" (Azərbaycan Gəncləri qəzeti, 1968). 1921-ci ilin fevralın 13-də daşnaklar Q. Njdenin başçılığı ilə İrəvan qəzasının bəzi yerlərində terrorlar törətməyə başladılar. Qızıl Ordunun bölmələrinə vəhşicəsinə divan tutuldu, onlarca əsgər və zabit Njdenin əmri ilə Qndevaz

qayasından atıldı. Abbasqulu bəyin rəhbərliyi ilə "Qırmızı Tabor" daşnakların Dərələyəzdə başlanmış hücumunun qarşısını aldı, Şərur istiqamətində cəbhəni yarıb İrəvandakı terrorçular ilə birləşmək cəhdlərini boşa çıxardı. 1921-ci ilin may-iyun aylarında Dərələyəz uğrunda gedən döyüşlərin mərkəzi "Qırmızı tabor" un mövqe tutduğu Danzik-Cüvə mövqeləri idi. Rind kəndi ətrafında gedən qızğın döyüşlərdə Abbasqulu bəyin bacarıqlı və hərbi rəhbərliyi nəticəsində daşnaklar məhv edildi və kənd azad edildi. Döyüşün əsas mərkəzi Arpa, Cüvə, Yelpin, Rind kəndləri olsa da, Çenqovur və Xaçik tərəflərdə də daşnaklar fəaliyyət göstərirdilər. Düşmənin gücünü öyrənmək üçün taborun cəsur döyüşçüsü, Caqazir kəndindən olan Mehralı Hətəm oğlu kəşfiyyat məqsədilə Xaçik kəndinə göndərildi. Lakin Mehralı daşnakların əlinə keçdi və mərdliklə, dəyanətlə əbədiyyətə qovuşdu (Bərdə qəzeti, 1992).

Daşnaklar vəhşicəsinə törətdikləri qətliamlara baxmayaraq artıq son günlərini yaşayırdılar. 1921-ci ilin aprel-iyul ayları ərzində gedən döyüşlərdə daşnakların 8 minə yaxın piyada (süngüçü), 3 min süvari, 74 pulemyotçu və 28 topu məhv edilərək quldurluqlarına son qoyuldu. 1921-ci ilin iyul ayında bütün hərbi hissələr öz qərargahlarına qayıtdılar. Daşnak hökumətinin tör-töküntülərinə son qoyulduqdan sonra Ermənistanda-hayıstanda Sovet hakimiyyəti quruldu. Ermənistan-hayıstan İnqilab Komitəsi quldur əksinqilabçı daşnakların məhv edilməsində böyük rəşadət və fəaliyyət göstərənlərə dövlət mükafatları təqdim etdilər. Eyni zamanda "Qırmızı tabor"un rəşadətli, qorxubilməz komandiri Abbasqulu bəy Şadlinski "Qırmızı Bayraq" ordeni ilə təltif olundu. Həmçinin taborun qəhrəman döyüşçülərindən İbrahim Fərzəliyev, Qasım Hüseynov, Nəcəf Əliyev, Fətulla Hüseynov, Ələkər Sadıqov, Əli Qədimova (ölümündən sonra), ümumilikdə 19 nəfərə "Qırmızı Bayraq"ordeni təqdim edildi. "Qırmızı tabor"un bacarıqlı və igid komandiri Abbasqulu bəy Şadlinskinin təltifi haqqındakı qərarda göstərilirdi: "Ermənistan-hayıstan fəhlə, kəndli və qızıl əsgər deputatları MİK vətəndaş A.Şadlinski, Sizi sosialsit vətəninin qarşısında vəzifənizi yerinə yetirmək və 1921-ci il fevralın 17-dən aprelin 16-dək olan dövrdə daşnaklara qarşı mübarizədə igidlik göstərdiyiniz üçün sosialist inqilabının Sovet nişanı olan "Qırmızı Bayraq"ordeni ilə təltif edir".

**(Ermənistan-hayıstan MİK-in 30 may 1921-ci il 56 nömrəli qərarı)**

Abbasqulu bəy Şadliniski igid, cəsur,mərd, məğlubedilməz, düşmənlə mübarizədə iradəli, inadkar olmaqla yanaşı, həm də həddindən ziyadə humanist və bəşəri keyfiyyətləri özündə birləşdirən, möhkəm xarakterli bütöv bir şəxsiyət idi. Məlum olduğu kimi, daşnakların bir hissəsi adını dəyişərək bolşevik donunda sovet hayıstanında mühüm orqanlarda fəaliyyət göstərməyə başladılar. Əlbəttə ki, daşnaklar terorçu əhval-ruhiyyəsində yaşayan quldurlar təşkilatında cəmləşmişdilər və vəziyyətdən istifadə edərək özlərini "dövlət" elan etmişdilər. Onların naqis əqidəsinə tabe olmayan hər kəs onların düşməni idi və ona qarşı son dərəcə amansız idilər. Hayların özlərindən bu barədə danışanların olması haqqında kifayət qədər nümunələr var və onların mətbuatında bu barədə çox yazılmışdır. C Ağayan "Erməni-hay və Azərbaycan xalqlarının əsirlik dostluğu adlı kitabında (C. P. Ağayan, İrəvan – 1972) yazır: "Qəmərli rayonunda Qızıl ordu hissələrinin və daşnaklara nifrət edən hayların daşnaklar tərəfindən qətl edilməsinin qarşısını alan Azərbaycan xalqının qəhrəman oğlu Abbasqulu bəy Şadliniskinin rəhbərlik etdiyi "Qırmızı tabor" adlı dəstə olmuşdur. Dərələyəzdən hücum edən quldur daşnakların həmləsi də onun dəstəsi tərəfindən dağıdıldı. Daşnaklar təkcə türk və müsəlmanları qətl etməklə kifayətlənmir, onların istəklərinə etiraz edən öz soydaşları olan hayları da vəhşicəsinə öldürür, onların var-yoxunu qarət edirdilər".

1921-ci ildən Sovet İttifaqı Kominist Partiyasının üzvü olan Şovar Əmirxanıyanın (Kommunit qəzeti, 25 noyabr 1960), Mkırtıçyan və P. Şirazyan (sovet ermənistanı-hayıstanı, 1957), ehtiyatda olan general Sovet İttifaqı Qəhrəmanı A. Karapetyan (Azərbaycan gəncləri, 1964) və digərləri A.Şadliniskinin daşnak təcavüzlərinə qarşı mübarizəsi, onun rəhbərlik etdiyi "Tabor" barədə, taborun əsgərlərinin haylara qarşı humanist davranışları barədə maraqlı, məzmunlu və real faktları əks etdirən xatirələr yazmışlar. Hayıstan SSR xalq Komissarları Sovetinin sədri A.F.Myasnikov Hayıstanda Sovet Hakimiyyətinin qurulmasının birinci ildönümü 1921-ci il noyabrın 29-da keçirilən tədbirdəki məruzəsində yazmışdır: "Yoldaş Abbasqulunun "Qırmızı taboru" qaniçən daşnaklardan təkcə türkləri deyil, eyni zamanda rusları, aysoriləri və əbədi qardaşları hayları qoruyub xilas etmişdir". Hay-erməni tarixçisi Hayro Sarkisov yazir ki, "iki aydan çox bir müddətdə" Qırmızı tabor "dəstəsinin döyüşçüləri sadə hayların da var-dövlətini talayan daşnaklara qarşı qəhrəmancasına vuruşdular. Onların igid

komandiri Abbasqulu bəy Şadlinski təkcə müsəlmanları deyil, eyni zamanda daşnakların təcavüzünə məruz qalmış hayları da qoruyurdu. Daşnaklar bütün ərzağımızı əlimizdən almışdı. Belə çətin anlarda A.Şadlinski və əsgərləri öz çörəklərini bizimlə bölüşürdü. O, son dərəcə xeyirxah, səmimi, həm də ciddi adam idi. Baxmayaraq ki, daşnaklarla biz eyni kökdənik və onlar A. Şadlınskinin elini-obasını viran qoymuş, doğmalarını vəhşicəsinə öldürmüşdülər, ancaq o bizə qarşı elə münasibət bəsləmədi, əksinə, bizi öz qanımızdan olan daşnakların pəncəsindən xilas etdi. Bütün bu faktlar sübut edir ki, Abbasqulu bəy və onun mənsub olduğu türk-azərbaycan xalqı beynəlmiləl, humanist əqidəli, şüurlu, vicdanlı və ulu bir millətdir. Mən belə bir böyüklük qarşısında soydaşlarımın vəhşiliyinə görə utanaraq baş əyirəm" (Hayro Sarkisov, Azərbaycan oğlu-Hayıstan qəhrəmanı, Kommunist qəzeti, 1971).

Hay-erməni tədqiqatçısı İ. Tahiryan yazır: "Azərbaycan xalqının qəhrəman oğlu yoldaş Abbasqulu öz dəstəsi ilə qəddar daşnak komandirləri Dro, Kazo və Primovun quldur dəstələrinə qarşı qəhrəmancasına döyüşərək hay və müsəlmanları qətliamdan xilas etmişdir" (İ. Tahiryan "Şadlinskinin qırmızı taboru" Kommunist qəzeti, 1970).

Bolşevik partiyasına qoşulmuş Ovhannes Kostanyan yazır: "Biz sadə haylar yaxşı bilirdik ki, bu mərd, xalq arasında şöhrət qazanmış Abbasqulu bəy gözəl insan, çox yaxşı komandir idi. O, imperializm əlaltısı olan daşnaklara qarşı iki il vuruşmuşdu. Bu gün sağ qalıb yaşayan zəhmətkeş haylar ona borcluyuq" (Sovet hayıstanı-Ermənistanı qəzeti, 1960).

"1920-ci ilin payızında Naxçıvan kommunistlərinin təşəbbüsü ilə"Qırmızı tabor "dəstəsinin komandiri Naxçıvana dəvət olundu. Daşnaklara qarşı müharibənin qəhrəmanı Abbasqulu ağa zəhmətkeş İrəvan sakinlərini quldur daşnakların zülmündən xilas etdi ("S. P. Ağayan "Zaqafqaziya xalqlarının əsirlik dostluğu "Hayıstan, 1970, s. 384).

Hayıstan-ermənistan SSRİ-nin mərkəzi komitəsinin birinci katibi, SSR-nin ali sovetinin deputatı, SSR-nin Livanda səfiri olmuş Suren Akopoviç Tovmasyan yazırdı: "Daşnakların vəhşilikləri o qədər böyük idi ki, onları tam olaraq yadda saxlamaq çox çətindir. Bir insanın bu qədər vəhşi ola biləcəyini heç cür qəbul edə bilmirəm. Hətta vəhşi, yırtıcı heyvanlar belə yeyib doyduqdan sonra sakitləşir və yuvasına çəkilir. Daşnaklar isə əksinə on minlərlə, bəlkə, daha da çox günahsız uşaqları, qadınları, qocaları işgəncə ilə öldürdükcə həzz alır və daha çox insan qətl etmək istəyirdilər. İrəvanda, Zəngibasarda, Vedibasarda, Dərələyəzdə, Şərurda, Sürməlidə, Üçmüədzində əhalinin üçdə iki hissəsi öldürülmüş, yarım milyondan çox əhali dərbədər düşmüş və bu ərazidə olan bütün yaşayış məskənləri yandırılaraq məhv edilmişdir. Hərdən təəccüb edirəm ki, doğrudanmı daşnaklar da insandır və mənimlə eyni etnik kökə mənsubdurlar?!" (S. A. Tovmasyan-Sovet Hayıstanın 40 illiyi, 1960, s. 11).

**Sovet dövründə xalqa xidmətləri**

Hay daşnak hərbi qüvvələri türklərə qarşı apardığı soyqırımlara son qoyulduqdan sonra bir müddət A. Şadlinski Naxçıvan Sovet Sosialist Respublikasının sərhəd mühafizə xidmətində 3-cü qarnizonun rəisi işlədi. Sovet hökuməti daxildə möhkəmlənməyə başladıqca qoşun hissələrində ixtisaslaşma prosesi sürətlə inkişaf edirdi. Bu baxımdan daha artıq ixtisaslaşmış hissələrin sərhəd mühafizə xidmətində cəmləşdiyi üçün "Qırmızı taborun" döyüşçüləri və onların cəsarətli komandiri A.Şadlinski təxris olundu. Bütün ömrünü xalqına xidmət etmiş bir insan üçün hansı ictimai-siyasi quruluşda yaşamağın ciddi bir əhəmiyyəti olmadığı üçün A.Şadlinski də təxris olunduqdan sonra doğma yurdu Vediyə qayıdaraq müxtəlif vəzifələrdə çalışaraq xidmət etməyə davam etdi. O, son dərəcə fitri istedada malik vətənpərvər bir şəxsiyyət olduğuna görə istənilən sahədə uğurlu nəticə əldə etmək bacarığına malik idi. 1928-ci ildə A. Şadlinskiyə Dəvəli kirəc mədənini işə salmaqla yanaşı sement zavodunun tikilməsi vəzifəsi tapşırılır. Onun rəhbərliyi, əzmkarlığı və cəfakeşliyi ilə işə salınan bu zavod, sonralar "Ararat sement zavodu" adı ilə fəliyyət edirdi (Vətən Səsi qəzeti, 1994).

1930-cu illərdə bütün SSRİ ərazisində kənd təsərrüfatının yenidən qurulması, kolxoz, sovxoz quruluşu yaradılmağa başlanıldı. ÜİKPUK-nin qərarında kolxoz quruluşu tədricən və könüllü prinsip əsasında aparılması göstərilsə də, partiyanın və dövlətin bu qərarı bir sıra yerlərdə xüsusilə Ermənistan-hayıstanın türklər yaşayan rayonlarda məqsədli olaraq kobudcasına pozulurdu. Varlı kəndlilərin-qolçomaqların və nüfuzlu şəxslərin var-dövləti hökumətin adıyla zorla əllərindən alınırdı. Sözsüz ki, bütün bu olanlar insanların heysiyyatına toxunduğu üçün çıxış yolunu silahlı mübarizədə görürdülər. Məhz vaxtilə daşnak qoşunlarında türklərə qarşı soyqırımlar törətmiş, məğlub olduqdan

sonra bolşevik libası geyinib hökümətdə mühüm vəzifə tutmuş, xüsusi xidmət orqanlarında yerləşmiş daşnakların istədikləri də bu idi ki, vaxtilə onlara qan uddurmuş "Qırmızı taborun" döyüşçülərindən qisas alsınlar. Bolşevik donu geyinmiş və sovet hayıstanında vəzifə tutub türklərə qarşı yeni bir formada genosid başladan hökümət nümayəndələrinin Naxçıvan, Şərur, Vedi, Keçili, Yayçı, Millidərə daxil olmaqla 15 kəndin qeyrətli sakinləri silahlı mübarizəyə qalxdılar. Haqsızlığa qarşı etiraz edən bu silahlı dəstənin başında duran el içində böyük nüfuz və hörmət sahibi, daşnaklara qarşı mübarizədə A. Şadlinski ilə çiyin-çiyinə vuruşmuş Kərbəlayi İsmayıl və "Qırmızı Bayraq" ordeni ilə təltif olunmuş Məhərrəm Pənahoğlu idi.

Hayların planı əvvəlcədən hazırlanmış ssenari əsasında davam edirdi. Əvvəlcə, hayıstanda sovet hökümətinin qurulmasında xidmətlərinə görə təltif olunmuş Qırmızı taborçuları üsyankar və vətən xaini kimi tanıtmaq, sonra isə onların sərt şəkildə cəzalandırılması haqqında dövlətdən göstəriş almaq! Planın tərkib hissəsində ən əsas məsələ Abbasqulu bəyin qətlə yetirilməsi dururdu. Bunun üçün də regionun ən hörmətli və nüfuzlu şəxsi olan Abbasqulu bəyi bu məsələyə daxil etmək lazım idi. Çünki etiraza qalxan silahlı dəstənin rəhbərləri və üzvlərinin əksəriyyəti Abbasqulu bəyin sadiq döyüş yoldaşları idi və onlar ancaq komandirlərinin-əfsanəvi qəhrəman, nümunəvi vətəndaş, təkrarolunmaz şəxsiyyət Abbasqulu bəyin sözünü eşidərlər...

Plana uyğun olaraq hayıstan xüsusi xidmət orqanlarının (KQB) 2 nümayəndəsi Arşakyan və Güləmiryan Abbasqulu bəyin evinə gəlirlər. Uzun danışıqlardan sonra Abbasqulu bəyi silahlı dəstə ilə görüşməyə razı salırlar və dövlətin adından zəmanət verirlər ki, "əgər qan tökmədən silahı yerə qoyub təslim olsalar, bağışlanacaqlar".

Abbasqulu bəy Şadlinski və Qırmızı taborun qəhrəman döyüşçüləri "Qırmızı Bayraq" ordenli, kolxoz sədri Xəlil Mehdioğlu danışıqlar aparmaq üçün yola çıxırlar (Bəzi məlumatlara görə M.TALIBOV familyalı bir nəfər də onlarla gedir, lakin onun haqqında heç kim dəqiq bir məlumata sahib olmadığı üçün harda və necə yoxa çıxdığı barədə məlumat yoxdur).

Hayıstan xüsusi xidmət orqanları Abbasqulu bəydən əvvəl silahlı dəstəyə qısa məzmunlu bir məktub göndərirlər. Məktubda yazılırdı: "Abbasqulu öz keçmiş döyüş yoldaşlarına xəyanət edib ermənilərlə danışıq aparır, yaxın günlərdə sizin yerinizi öyrənmək məqsədilə sizinlə görüşməyə gələcək. Yerinizi öyrəndikdən sonra ermənilərlə birləşib hamınızı məhv edəcək".

Bu məlumatı həmin vaxt silahlı dəstə ilə birlikdə olan Məhərrəm Pənahoğlu da təsdiqləyərək qeyd edir: "məktubun məzmunu qaçaqlar arasında böyük mübahisəyə səbəb oldu. 400 nəfərə yaxın adam Abbasqulu bəyi öldürüb öldürməmək məsələsini səsə qoydu və sonda böyük əksəriyyət öldürülməsini tələb etdi. Biz bir neçə nəfər gücsüz qaldıq. Abbasqulu bəyi Qəmlo deyil, Kərkablı Bəhlul öldürdü. Güllə atılanda Kərbəlayı İsmayılın böyük oğlu Əsədlə mən üzümüzü qayalara tərəf çevirib ağlayırdıq. Mən çox dedim ki, güllə atmayın, qoyun gəlsin oturaq söhbət edək, onsuz da silahı yoxdur. Ancaq nə mənə, nə də Əsədə qulaq asan oldu"...

1930-cu il mart ayının 3-də Kolanı kəndi yaxınlığında Cığın dərəsində Azərbaycan xalqının qəhrəmanlıq tarixində xüsusi yeri olan Abbasqulu bəy Xanbaba bəy oğlu Şadlinski çoxsaylı qəhrəman soydaşlarımız kimi hay-erməni fitnəkarlığının qurbanı olaraq əbədi şəhidlik zirvəsinə ucaldı...

Bolşevik libası geyinmiş daşnaklar öz xəyanətkar, mənfur və bədnam xislətlərinə xas olan planlarını həyata keçirdilər. Abbasqulu bəyi öz keçmiş silahdaşlarının əli ilə şəhid edərək özləri kənarda qalmaqla qisas almış oldular. Lakin aradan uzun illər keçməsinə baxmayaraq biz öz tarixi keçmişimizi, bizə edilən haqsızlıqları, işğal olunmuş torpaqlarımızı, o torpaqlarda dolaşan əcdadlarımızın narahat olan ruhları qarşısında olan müqəddəs missiyamızı unutmayaraq, Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi, məğlubedilməz ordumuzun gücü ilə torpaqlarımızı azad etdik (Vətən Səsi qəzeti, 1994).

İndi Ağdərə rayon Başgüneypəyə özünümüdafiə dəstəsinin şəhid komandiri Əvəz Novruzovun və onunla birlikdə qəhrəmancasına şəhid olan döyüşçülərin ruhu şaddır ki, onların müqəddəs qanları ilə sulanıb vətənə dönüşən torpaqlarımız düşmən tapdağından xilas olunubdur. Abbasqulu bəyin də ruhu heç şübhəsiz ki, şaddır! Şaddır ona görə ki, o artıq inanır ki, Azərbaycan bayrağı bir gün gələcək Vedidə dalğalanacaqdır!!!

**Qırmızı Taborun Şöhrət Muzeyi**

Cəmi 44 illik ömrünün böyük hissəsini doğma yurdunun müdafiəsinə, qorunmasına, inkişafına, soydaşlarının xoşbəxtliyi, azadlığı və firavan yaşaması uğrunda mübarizəyə həsr etmiş, sonunda bu yolda öz canını fəda edərək şəhid olmuş Abbasqulu bəy Şadlinskinin həyat yolu nəsillərə gözəl nümunədir, gözəl örnəkdir. Onun irsinin öyrənilməsi, gənc nəslin hərbi vətənpərvərlik ruhunun daim yüksək tutulması üçün 1986-cı ilin oktyabr ayında İliç (indiki Şərur) rayonunda "Qırmızı Tabor" beynəlmiləl partizan dəstəsinin Şöhrət muzeyi yaradıldı. Muzey özlüyündə əfsanəvi sərkərdə Abbasqulu bəy Şadlinskinin və onun döyüş yoldaşlarının, həmçinin taborda döyüşmüş 80 nəfər Sədərəkli döyüşçünün həyat və mübarizə fəaliyyətini əks etdirirdi. Muzeyin salonlarında XX əsrin əvvəllərindəki ictimai – siyasi vəziyyəti əks etdirən tarixi materiallar geniş yer tuturdu. Tarixi şəxsiyyət A. Şadlinskinin həyat və mübarizə fəaliyyəti muzeyin xüsusi bir salonunda öz əksini tapırdı. Burada məğlubedilməz sərkərdənin uşaqlıq və gənclik illəri, təhsili, inqilabi fəaliyyəti, müxtəlif vaxtlarda çəkilmiş nadir şəkillər, qəzet və kitab materialları, xatirə əşyaları, arxiv sənədləri vasitəsilə izlənilmiş, həmçinin cəsur komandirin qılıncı, tüfəngi, hərbi paltarları, döyüş sursatları nümayiş etdirilirdi. Muzeyin salonlarından biri "Danzik müdafiə cəbhəsi" adlanır. Burada Danzik kəndində aparılan döyüş əməliyyatlarına aid maraqlı materiallar toplanmış idi. Həmin müdafiə cəbhəsini təmsil edən Əli Həsən oğlu Əliyev, İbrahim Fərzəliyev, Həsən Şahverdioğlu, Əfruz, Miryusif Seyidov, Bəhmən Məmmədov, Hüseyn Vəkilov və digərlərinin döyüşlərdəki fəaliyyəti muzeyə gələnlərin diqqətini özünə cəlb edirdi.

Muzeydə A. Şadlinskinin büstü və portreti də diqqəti çəkən nümunələrdən idi. Qəhrəman sərkərdənin büstünü Naxçıvan MSSR-in əməkdar mədəniyyət işçisi Hüseynqulu Əliyev və Azər Əliyarov hazırlamışdılar.

"Şöhrət muzeyi" gənclərin hərbi vətənpərvər ruhda tərbiyə olunmasında böyük əhəmiyyətə malik ideoloji təbliğat məktəbi idi. Öz fəaliyyətləri ilə tarixi salnamə yaratmış igidlərin ömür yolu ən effektli nümunədir. Çünki gənclər öz vətənlərini və qəhrəmanlarını tanıdığı qədər sevir. Nə qədər öz qəhrəmanını çox tanıyırsa, bir o qədər də onun ömür yolunu özünə nümunə seçər və bu yolda vətən fədaisi olmağa çalışar!

Məlum olduğu kimi hay-erməni fitnəkarlığının qurbanı olmuş tarixi şəxsiyyət A. Şadlinskinin qəbri Böyük Vedidə orta məktəbin həyətində olmuşdur. Hayıstan – Ermənistan KPMK-nin 1957- ci ildəki qərarına əsasən Abbasqulu bəyin və digər inqilab fədailərinin məzarları yenidən götürülməli idi. Əlbəttə ki, bu qərar icra olunmadı. Çünki haylar Abbasqulu bəyə və onun silahdaşlarına qarşı kinlərini unutmamışdılar və onları hayların ən böyük düşmənləri adlandırırdılar. 1988-ci ildən sonra tarixi torpaqlarımızdan soydaşlarımız qovulduqdan sonra Abbasqulu bəyin məzarının vəziyyəti barədə heç bir məlumat əldə etmək mümkün olmamışdır. Ancaq daha acınacaqlı durum isə SSRİ dağıldıqdan və müstəqillik əldə etdiyimiz illərdən sonra tarixi yaddaşımıza və tarixi mənbələrə qarşı edilən bağışlanılmaz hərəkətlərdir. "Şöhrət muzeyi" Abbasqulu bəy şəxsiyyəti haqqında zəngin bir tarixi mənbə və hətta tarixşünaslıq məktəbi idi. Necə olur ki, belə bir muzey sözün həqiqi mənasında qarət edilərək yoxa çıxarılır, necə olur ki, öz ərazimizdə öz əlimizlə öz tariximiz, mədəniyyətimiz , mənəvi-ideoloji abidələrimiz məhv edilir?!

Belə qənaətə gəlmək olur ki, necə ki, Abbasqulu bəyin çiyin-çiyinə döyüşdüyü soydaşları ilə görüşə bilməməsinə səbəb olan məktubu özümüzdən biri olan xəyanətkarın əli ilə etdilərsə, Şöhrət muzeyini də məhz Abbasqulu bəyə aid bütün tarixi faktları və sənədləri məhv etməklə yaddaşlardan silmək üçün özümüzdən olan nadanların vasitəsilə etdilər. Bütün bunlar bir daha sübut edir ki, zaman-zaman dondan-dona girən haylar bu gün daha təhlükəli bir dondadırlar. Əgər sovet dövründə bolşevik donu geyinmişdilərsə, bu gün artıq daha fərqli, daha tanınmaz vəziyyətdə bizlərdən biri kimi görünərək öz çirkin missiyalarını həyata keçirməkdədirlər. Məhz buna görədir ki, Abbasqulu bəy kimi qəhrəmanlıq mücəssəməsi, tarixi şəxsiyyət haqqında nə orta məktəb dərsliklərində, nə də ali məktəblər üçün yazılmış tarix kitablarında bir cümlə belə yazılmayıb. Məhz bu gizli missionerlərin fəaliyyətinin nəticəsidir ki, məqalənin əvvəlində də vurğuladığımız kimi Əvəz Novruzov və onun kimi maddi varlığını, canını xalqına və dövlətinə qurban etmiş igidlər layiq olduqları fəxri adlarla təltif olunması üçün təqdim edilmir. Və nəticə etibarilə gənc nəslin öz qəhrəmanlarından xəbəri olmur (Vedibasar qəzeti, 2005).

Unutmamalıyıq ki, hay-erməni fitnəkarlığı heç bir zaman öz murdar xislətindən əl çəkməyəcək və hər zamankından daha buqələmun operativliyi ilə fəaliyyət göstərməkdədir. Onlara qarşı mübarizənin ən sadə yolu öz tarixi gerçəkliyimizi və bu obyektiv reallığın subyektləri olan vətən fədailərimizin ömür yolunu özümüzə tanıtmaqdır. Tarixi qəhrəmanlıq salnamələrimizdə Abbasqulu bəy Şadlinskinin fəaliyyəti öz unikallığı ilə seçilən bir reallığı özündə yaşatmaqdadır. Tanınmış, istedadlı şairimiz Şahmar Əkbərzadənin "Utanım yerinə" başlıqlı şeirindən nümunə ilə fikrimi oxuyucalara çatdırmağı daha məqsədə uyğun hesab edirəm:

Bu da ki, min illik Türk qəbristanı,
Analar kor oldu ağı deməkdən.
Utanım yerinə Türk yatağanı,
Gözlərin doymadı Türkü yeməkdən...
Utanım yerinə misri qılıncım,
Tüfəng çıxan kimi qınına girdin.
Utanıb-qızarıb sənə güvəncin,
Sən öz qanımıza yerikləyirdin...
Utanım yerinə qoç Koroğlu, din!
Düşmənin kim idi?-Həsən paşaydı.
"Leş bir yana, baş bir yana"- deyirdin.
Qalağa vurduğun qardaş başıydı.
Utanım yerinə, əmir Teymurum,
Əzdin Bəyazidi, qırdın Tatarı.
Sənin zəfərinlə sındı qürurun,
Yadlara qul oldu yurd balaları.
Şah babam Xətayi, ey Sultan Səlim,
"Çaldıran" deyəndə odlanıram mən.
Əsrlər keçsə də düzəlmir belim,
Sizin yerinizə utanıram mən.

Abbasqulu bəy Şadlinskinin mübarizə yolu bütünlüklə türk-müsəlman qırğını törədən və türk-müsəlman qanını axıtmaqdan zövq alan qəddar düşmənimiz haylara qarşı döyüşməkdən ibarətdir. Sürətlə dəyişən qloballaşma, multikulturalizm adı altında qütbləşən dünyada ümumtürk birliyinin qorunması, prinsipiallığı, milli prioritetlərdən biridir (Vedibasar qəzeti, 2022).

Abbasqulu bəyin fəaliyyəti, Başgüneypəyə özünü müdafiə dəstəsinin döyüş yolu bütün türk dünyasında təbliğ olunası qəhrəmanlıq salnamələridir. Görkəmli şairimizin şeirindəki nümunələrdən tam fərqli olan bu kimi tarixi qəhrəmanlarımızın döyüş yolu və həyatı əsl qəhrəmanlıq, vətənpərvərlik, cəsurluq, məğlubedilməzlik nümunəsidir və gecikmədən bunun ideoloji və fəlsəfi mahiyyətinin sosial təbliğatını geniş şəkildə aparmalıyıq!

Unutmayaq ki, tarix – ondan dərs alanlar üçün işıqlı gələcək , dərs almayanlar üçün isə sonu bilinməyən qaranlıq uçurum!

## Nəticə

İstənilən bir məsələnin müzakirəsi aparılarkən, həlli yolu araşdırılarkən obyektiv, sosial reallıqları nəzərə almadan nəticəyə nail olmaq mümkün deyildir. Təbiət kimi cəmiyyətdəki insanların hədəf, maraq və mənafeləri çoxçalarlıdır, bəzən antoqonit xüsusiyyət daşıyan, deqradasiya, transformasiya olan ideya və dəyərlər, elitar, kütləvi andeqraund nəzəriyyələr meydana çıxdığına görə tarix fəlsəfəsi müxtəlif dünyagörüşlərin, sosial-siyasi proqramların qarşıdurma və mübarizə meydanına dönüşür. Bu baxımdan hər bir siyasi partiya, müxtəlif dövrlərdə hakimiyyətdə olan hökumətin ideoloji nəzəriyyə daşıyıcıları, müxtəlif sosial qruplar keçmişi öz mənafeləri mövqeyindən izah etməyə çalışırlar.

Çağdaş tarixin, sosiologiyanın və iqtisadiyyatın öncüllərindən biri olaraq qəbul edilən XIV əsr filosofu, dövlət xadimi, tarixçi, orta əsrlərin ən böyük mütəfəkkirlərindən biri olan İbn Xəldun (tam adı Əbu Zeyd Əbdürrəhman İbn Məhəmməd İnb Əl Hədrami) tarix elmi haqqında fikirlərində qeyd edir: "Tarix elmi millətlər və qövmlərin bir-birindən nəql və rəvayət etməkdə olduğu elmlərdəndir.

Xalq və heç bir şeyə önəm verməyən qafillər belə tarix öyrənmək istəyirlər. Tarixi anlamaq cəhətdən alimlər və cahillər bir-birinə bərabərdir". Doğrudan da, tarix elə bir elm sahəsidir ki, istənilən peşənin sahibi onunla maraqlanır və nələrinsə, kimlərinsə haqqında müəyyən məlumatı yiyələnmək istəyində olur. Geniş kütlənin öyrəndiyi tarixin zahiri təzahür mənasıdır. Tarixin içində, nüvəsində, bətnində saxlı olan məna isə araşdırmaq, düşünmək, araşdırmaqdan varlığın-kainatın səbəb və nəticələrini analitik anlamaq, hadisələrin baş verməsi, gedişatının səbəb və tərtibatını bilməkdən, fəlsəfi mahiyyətini anlayıb anlatmaqdan ibarətdir. Bütün bunlar tarixin hikmətlə dolu, şərəfli, ləyaqətli insanların cəm olduğu bir toplumda birləşməsi üçün rolu və əhəmiyyəti əvəzolunmazdır. Məhz bu baxımdan tarix hikmət, həqiqət, mərifət və fəlsəfə elmlərindən biri kimi daim bəşəriyyət və onun inkişaf dinamikası haqqında mütərəqqi ideya və əməllərin öyrənilməsi, eyni zamanda tətbiqi üçün əsas tərbiyəvi nümunə olaraq qalacaqdır. Tarix insanların, təbiətin, cəmiyyətin, insanların və hətta insan təfəkkürünün yaddaşıdır. Tarix yaddaşdır, yaddaş isə hikmətdir. Deməli, hikmətin özü elə tarixdir, tarixin fəlsəfi roludur. Beləliklə, bir xalqın mövcudluğunu sübut edən onun tarixidir, bu gününü və sabahını daha yaxşı yaşaması, qurması, inkişaf etdirə bilməsi üçün isə onun verdiyi dərsin hikmətini və fəlsəfi mahiyyətini milli-ideoloji təfəkkürün dərk etmə səviyyəsində saxlamaqdır.

Tariximizi, özümüzü unutmayaq ki, gələcəkdə özümüzdən olanların, özümüzdən yazdığı tariximiz olsun!

**Ədəbiyyat**

1. *Azərbaycan tarixi yeddi cilddə*. (2008). V cild. Elm.
2. *Azərbaycan Gəncləri qəzeti*. (1986, 2 dekabr).
3. *Aydınlıq qəzeti.* (1991, 24 avqust)
4. *Bərdə qəzeti.* (1992, 26 sentyabr).
5. Əliyev, Ə. (1990). *Qırmızı tabor*. Gənclik.
6. *İrəvan Vilayətinin Müfəssəl Dəftəri.* (1590). H. Qaramalı, M. Aladdin. (tərcümə ed.) (2023). Nəşriyyat şöbəsi.
7. *Kommunist qəzeti.* (1986, 25 noyabr).
8. *Sovet Naxçıvanı qəzeti*. (1986, 16 noyabr).
9. *Sovet Naxçıvanı qəzeti*. (1986, 31 oktyabr).
10. *Sovet Naxçıvanı qəzeti.* (1986, 27 avqust).
11. *Vətən Səsi qəzeti*. (1994, 1 iyun).
12. *Vətən Səsi qəzeti*. (1994, 24 may).
13. *Vedibasar qəzeti*. (2005, 16-31 mart).
14. *Vedibasar qəzeti*. (2007, 15-28 fevral).
15. *Vedibasar qəzeti*. (2022, 01-30 noyabr).

Daxil oldu: 24.09.2024
Baxışa göndərildi: 01.11.2024
Təsdiq edildi: 18.01.2025
Çap olundu: 22.02.2025

## Ədəbiyyat

1. İbrahimov, A. (2005). *İbtidai bitkilər*.
2. İbrahimov, A. (2008). *Mikologiya*.
3. Akhundov, T. M. (1977). *Opredelitel' gribov Ascochyta*. Izd. «Nauka».
4. Akhundov, T. M. (1979). *Mikoflora Nakhichevanskoy ASSR.*
5. Aghayeva, G. B. (1969). *Pod Phytollosticta v Azerbaydjane*. Avtoref. kand. biol. nauk.
6. Ainsvorth, G. (1971). *R. Bisbys* «*Dictionary of the fungi*».
7. Bondartseva, M. A. (1975). *Klyuch dlya opredeleniya rodov trutovykh gribov*. Elm.
8. Bilay, V. I., & Gvozdyak, R. I. (1989). *Osnovy obshchey mikologii*.
9. Bondartseva, M. A., & Parmasto, E. Kh. (1986). Opredelitel' gribov SSSR. *Nauka*, 1, 190.
10. Dudka, I. A., & Vasser, S. P. (1987). *Griby*.
11. Gasich, Ye. L., Titova, Yu. A., & Berestetskiy, A. O. (1999). Mikobiota travyanistykh rasteniy o-va Valaam. *Mikologiya i fitopatologiya*, 33(6), 392-401.
12. Guseynov, Ye. S. (1970). *Mikoflora i osnovnyye gribnyye bolezni plodovykh porod Azerb.SSR.* Avtoref. diss. Na soisk. kand. biol. nauk.
13. Guseynov, B. F. (1982). *Rod Septoria v Azerbaydzhane.* Avtoref. diss. na soiks. kand. biol. nauk.

Daxil oldu: 28.08.2024
Baxışa göndərildi: 06.10.2024
Təsdiq edildi: 15.01.2025
Çap olundu: 22.02.2025

https://doi.org/10.36719/2663-4619/111/178-185

**Səadət Cahangirova**
Bakı Slavyan Universiteti
https://orcid.org/0009-0004-9875-3146
cahangirova58@bk.ru
**Sayalı İbrahimova**
Bakı Slavyan Universiteti
https://orcid.org/0009-0004-6759-9377
ibrahimova sayali@gmail.com
**Gülarə Sadıxova**
Bakı Slavyan Universiteti
https://orcid.org/0009-0006-6846-9499
gulara.sadixova@rambler.ru

# Torpağın qorunması

**Xülasə**

Torpağın insandan mühafizəsi insanların qarşısında duran əsas məsələlərdən biridir. Belə ki, torpaqdakı zərərli birləşmələr gec-tez insanın orqanizminə daxil olur.

Ümumiyyətlə, torpağın çirklənməsinə müxtəlif tullantılar, ağır metallar, radioaktiv maddələr, kimyəvi vasitələr və s. səbəb olur. Atmosferdə və hidrosferdə baş verən dəyişikliklər müxtəlif xəstəliklərin əmələ gəlməsinə, hətta bəzi canlıların məhvinə gətirib çıxara bilir. Ona görə də insanın normal mövcudluğu üçün ətraf mühitin qayğısına qalmaq və təbii tarazlığı qoruyub saxlamaq lazımdır.

***Açar sözlər:*** *torpaq, çirklənmə, ekologiya, qanunvericilik, mühafizə*

**Saadat Jahangirova**
Baku Slavic University
https://orcid.org/0009-0004-9875-3146
cahangirova58@bk.ru
**Sayali Ibrahimova**
Baku Slavic University
https://orcid.org/0009-0004-6759-9377
ibrahimova sayali@gmail.com
**Gulara Sadikhova**
Baku Slavic University
https://orcid.org/0009-0006-6846-9499
gulara.sadixova@rambler.ru

# Soil Protection

**Abstract**

The protection of environment from humanity is the main issue that standing in front of mankind.

So, the destructive alliances in the soil enter the human organism sooner or later. In general, different waste products, serious materials, chemical funds and so on are caused to the pollution of ground. Changes in atmosphere, hydrosphere can cause different illnesses' appearances, even some creatures' death. That's why we have to take care of the environment and must protect the natural balance in order to provide the normal existence of humanity. Because the decrease of the level of human health care depends on not only his mode of life, but also the social- economic factors; heredity and the natural conditions.

***Keywords:*** *soil, pollution, ecology, legislation, protection*

 

## Giriş

Dünyanın torpaq fondu — Antarktida və Qrenlandiya istisna olmaqla Yer kürəsinin bütövlükdə quru sahəsini əhatə edir.

Torpaq sahəsi 13 milyard hektardır, yəni yer kürəsinin təxminən üçdə birini təşkil edir. Torpaq sahəsinin 4,8 milyard ha (37 %) kənd təsərrüfatı təyinatlı, 4,1 milyard ha (31,5%) meşələr, 4,1 mil. ha (31,5 %) digər torpaqlardır, onların 10 %-i becərilən torpaqlardır, otlaqlar – 17 %-i təşkil edir, təxminən eyni miqdarda torpaq emal üçün münasibdir, lakin onun kənd təsərrüfatında istifadəsi iqtisadi cəhətdən sərfəli deyil (Coğrafiya – 11).

Beləliklə, insanların qidalanması əsasən 1450 milyon hektar becərilən torpaqlar hesabına təmin edilir, ona görə də torpaqdan qayğı ilə istifadə edilməli və o ciddi mühafizə olunmalıdır. Deməli, həm öz sağlamlığımızı, həm də gələcək nəslin sağlamlığını qorumaq üçün təbiəti, o cümlədən torpağı mühafizə etmək vacibdir. Bu hər bir insanın borcudur.

**Torpağın qorunması**

Torpağın insanlardan qorunması insanların ən vacib vəzifələrindən biridir, çünki torpağa daxil olan hər hansı bir zərərli birləşmə, gec-tez aşağıdakı yollarla insan orqanizminə də daxil olur.

***Birincisi***, insanlar tərəfindən içməli və digər ehtiyaclar üçün istifadə edilə bilən açıq su anbarlarına və qrunt sularına çirkabın axıdılması davamlı olaraq baş verir.

***İkincisi,*** torpağın rütubətindən, qrunt sularından və açıq su hövzələrindən bu çirkləndiricilər bu suyu istehlak edən heyvan və bitkilərin orqanizmlərinə daxil olur və sonra qida zəncirləri boyunca yenidən insan orqanizminə daxil olurlar.

***Üçüncüsü,*** insan orqanizmi üçün zərərli olan bir çox birləşmələr toxumalarda və hər şeydən əvvəl sümüklərdə yığılma qabiliyyətinə malikdirlər.

Tədqiqatçıların fikrincə, hər il biosferə 50-60 %-i orqanik birləşmələr olmaqla təxminən 20-30 milyard ton bərk tullantılar, bir milyard tona yaxın isə qaz və aerozol xarakterli tullantılar şəklində daxil olur və əlbəttə, bu planetimizin hal-hazırda sayı 7 milyarddan çox olan insanların sayından azdır. Litosferdən gələn çirkləndiricilər torpağa necə daxil olur?

Əksəriyyəti antropogen xarakterli, yəni insanın fəaliyyəti ilə bağlı olan torpaq çirkələndiricilərini həmin çirkləndiricilərin torpağa daxil olma mənbəyinə görə aşağıdakılara bölmək olar:

*Atmosfer yağıntıları yolu ilə* — müəssisələrin fəaliyyəti nəticəsində atmosferə daxil olan bir çox kimyəvi birləşmələr (qazlar — kükürd və azot oksidləri), sonra atmosfer rütubətinin damcılarında həll olunur və yağıntı ilə torpağa düşür; *toz və aerozol şəklində çökmə yolu ilə* — quru havada bərk və maye birləşmələr adətən birbaşa toz və aerozollar şəklində çökərək torpağa düşür; *qazlı birləşmələrin torpaq tərəfindən birbaşa udulması yolu ilə* — quru havalarda qazlar birbaşa torpaq, xüsusən də yaş torpaq tərəfindən udula bilər; *bitki qalıqları ilə* — müvafiq temperatur və təzyiqdən asılı olan müxtəlif zərərli birləşmələri yarpaqlar tərəfindən sorulur və ya yer səthinə çökür, daha sonra yarpaqlar töküləndə bu birləşmələr torpağa daxil olur.

Bütün bu mənbələri ümumiləşdirsək, onda məlum olur ki, bütün bu hallarda torpaq çirkləndirilir və son nəticədə, torpaq vasitəsi ilə, yəni torpaq üzərində yetişən müxtəlif məhsullar istehlak edilərkən həmin zərərli maddələr insan orqanizminə daxil olur (Lazutkina, Somin, 2007, s. 92).

**Tədqiqat**

Ümumdünya Səhiyyə Təşkilatının məlumatına görə, dünyada gelminotozlarla 1milyard 400 min xəstələik hadisəsi qeydə alınır, onların içərisində 100 mindən çox hadisə ölümlə nəticələnir (Torpağın sanitar mühafizəsi).

Müasir dövrdə əhalinin sağlamlıq vəziyyətini müəyyən edən amillərdən biri sosial cəhətdən şərtlənmiş xəstəliklər, o cümlədən helminitozlardır, onların payına bütün parazitar xəsləliklərin 99 %-i düşür. Ətraf mühitin bütün obyektlərindən helmintlər yumurtaları ilə daha çox torpagı, səthi su mənbələrinin suyunu, kənd təsərrüfatı bitkilərini, çirkab suları çirklənməyə məruz qoyur, torpaq isə əhalinin həyat şəraitinə və sağlamlıgına təsir edən ətraf mühit obyektələrinin arasında mühüm yer tutur. Torpağın çirklənməsi, orada olan toksinlərin toplanması, onun fiziki və kimyəvi xüsusiyyətinin pisləşməsinə səbəb ola bilər.

Torpaq təmasda olan mühitlərin (atmosfer havası, yeraltı sular) ikincili çirklənməsinin mənbəyi və insanın sağlamlığına həm birbaşa, həm də dolayı təsir göstərə bilər (Torpağın sanitar mühafizəsi).

Torpağın çirklənməsini təsnif etmək çətindir, müxtəlif mənbələrdə onların bölünməsi müxtəlif yollarla verilir. Bununla belə, ümumiləşdirib vurğulasaq, əsasən aşağıdakıları müşahidə etmək mümkündür:

*Torpağın çirklənməsi* — zibil, tullantılar, zibilliklər, çökmə süxurları; ağır metallar; pestisidlər; mikotoksinlər; radioaktiv maddələrin torpağa daxil olması ilə baş verir (Moiseyev, s. 189).

Bəşəriyyətin hava kimi ehtiyac duyduğu bir sıra təbii sərvətlər var, amma bu bir aksiomadır ki, olmadığı təqdirdə bir dəqiqədən az bir zamanda insan üçün həll olunmaz bir problemə çevrilə biləcək havanın özü qədər mühüm və əvəzolunmaz ikinci digər təbii sərvət canlı aləm üçün mövcud deyildir.

Məlumdur ki, planetimizin canlıları üçün həyati əhəmiyyəti olan atmosferin çirklənməsi əsasən hər il ümumilikdə bir milyarddan çox bərk tullantıları və qaz hissəciklərini "küləyə-açıq havaya» buraxan sənaye müəssisələrinin, nəqliyyatın və s. fəaliyyəti nəticəsində baş verir.

Bu gün havanın əsas çirkləndiriciləri karbonmonoksit və kükürd qazıdır. Ancaq, əlbəttə ki, freonları və ya xloroflorokarbonları unutmamalıyıq. Əksər alimlər onları atmosferdə azon dəlikləri deyilən dəliklərin əmələ gəlməsinin səbəbi hesab edirlər.

Freonlar istehsalda və gündəlik həyatda soyuducu, köpükləndiricilər, həllediсilər kimi, həmçinin aerozol paketlərində geniş istifadə olunur.

Həkimlər məhz atmosferin üst qatlarındakı azonun miqdarının azalmasının dərinin xərçəng xəstəliklərinin sayının artmasına səbəb olması qənaətindədirlər.

Məlumdur ki, atmosfer azonu günəşin ultrabənöşəyi şüalarının təsiri ilə mürəkkəb fotokimyəvi proseslər nəticəsində əmələ gəlir. Onun miqdarnın az olmasına baxmayaraq, biosfer üçün əhəmiyyəti olduqca böyükdür. Azon qazı ultrabənövşəyi şüaları udaraq onları neytrallaşdırmaqla yerdə yaşayan canlıları məhv olmaqdan qoruyur.

Freonlar atmosferə düşdükdə günəş şüalarının təsiri altında bir sıra birləşmələrə parçalanırlar, bunlardan isə xlor oksidi azonu ən intensiv şəkildə məhv edir (Novyye Publikatsii, 2025, s. 25).

Faydalı yağış damcıları — göylərdən gələn daha bir hədiyyə həmişə insanları sevindirsə də, bununla belə yer kürəsinin bəzi rayonlarında yağışlar çox ciddi təhükəyə çevrilmişdir. Turşu yağışları həll olunması çox çətin və mürəkkəb olan problemi yaratmışdır və bu problem beynəlxalq səviyyədə ilk dəfə BMT-nin ətraf mühitin qorumasına həsr edilmiş konfransında İsveç tərəfindən gündəmə gətirilmişdir. Elə həmin vaxtdan etibarən bəşəriyyətin təbiətin qorunmasına yönəlmiş fəaliyyətində ən böyük ekoloji problemlərindən birinə çevrilmişdir.

Turşu yağışları su hövzələrinə məhvedici zərərli təsir göstərir, meşə bitkilərinə və kənd təsərrüfatı əkinlərinə zərər verir və nəhayət, bütün bu maddələr insan həyatı üçün müəyyən təhlükə yaradır (Coğrafiya – 11, s. 84-86, 92).

Başımızın üstündəki göydən, ayağımızın altındakı yerdən heç də az əhəmiyyət kəsb etməyən üçüncü amil sivilizasiyanın mövcudluğu amilidir – bu planetin ***su ehtiyatlarıdır.***

Bəşəriyyət öz ehtiyacları üçün əsasən şirin sudan istifadə edir. Onların həcmi hidrosferin 2 %-dən bir qədər çoxunu təşkil edir və su ehtiyatlarının paylanması isə yer kürəsində son dərəcə qeyri-bərabərdir. Dünya əhalisinin 70 %-nin yaşadığı Avropa və Asiyada çay sularının cəmi 39 %-i cəmləşib. Dünyanın bütün regionlarında çay sularının ümumi istehlakı ildən-ilə artır.

Məlumdur ki, məsələn, bu əsrin əvvəlindən şirin su istehlakı 6 dəfə artıb və yaxın bir neçə onillikdə isə ən azı 1,5 dəfə artacağı gözlənilir.

Suyun keyfiyyətinin pisləşməsi ilə onun çatışmazlığı daha da ağırlaşır. Sənayedə, kənd təsərrüfatında və məişətdə istifadə olunan sular pis təmizlənmiş və ya ümumiyyətlə, təmizlənməmiş tullantılar şəklində su mənbələrinə qaytarılır.

Beləliklə, hidrosferin çirklənməsi ilk növbədə bunun nəticəsində, yəni sənaye, kənd təsərrüfatı və məişət tullantı sularının çaylara, göllərə və dənizlərə axıdılması yolu ilə baş verir.

Hal-hazırda bir sıra böyük çaylar çox çirklənmiş çaylar arasındadır — Reyn, Dunay, Sena, Ohayo, Volqa, Dnepr, Dnestr və s. çaylar bu cür çayların sırasındadır. Dünya okeanının çirklənməsi də artır və burada əhəmiyyətli rol təkcə kanalizasiya suları ilə çirklənmə deyil, həm də dənizlərin və okeanların sularına çoxlu miqdarda neft məhsullarının daxil olmasıdır.

Ümumiyyətlə, ən çox çirklənmiş daxili dənizlər Aralıq dənizi, Şimal, Baltik, Daxili Yaponiya, Yava, həmçinin Biskay, Fars və Meksika körfəzi hesab edilir.

Bundan əlavə, insan hidravlik qurğuların, xüsusən də su anbarlarının tikintisini həyata keçirməklə eyni zamanda hidrosferin sularının çevrilməsini həyata keçirir. Böyük su anbarları və kanallar ətraf mühitə ciddi mənfi təsir göstərir: onlar sahil zolağında qrunt sularının rejimini dəyişir, torpaqlara və bitki icmalarına təsir edir və son nəticədə onların akvatoriyaları münbit torpaqların böyük sahələrini tutur (Novyye Publikatsii, 2025, s. 391-395; Səlimova, Şahpələngov, Babayev, 2012).

Biz müstəqil şəkildə ətraf mühitin qayğısına qalmalıyıq və insanın normal mövcud ola biləcəyi təbii tarazlığı qorumalıyıq. Çünki biosferdə gedən bütün proseslər bir-biri ilə bağlıdır. Əhalinin sağlamlığı gündəlik həyat şəraitinin məcmusu ilə formalaşır və qorunur. Sağlamlığın səviyyəsinin azalması təkcə insanların həyat tərzindən, sosial-iqtisadi amillərdən, ətraf mühitin vəziyyətindən və irsiyyətdən deyil, həm də təbii şəraitdən asılıdır.

Bu gün dünyada və ayrı-ayrılıqda regionlarda ekoloji məsələlər o dərəcədə aktuallaşıb ki, bu məsələləri bir qurum və ya bir dövlət təkbaşına həll edə bilməz, yəni ekologiya ***qlobal*** məsələdir.

Təsadüfi deyil ki, bu problem qlobal səviyyədə də müzakirələrə çıxarılır, bütün dövlətlərdən planetin ekoloji durumunun yaxşılaşdırılması, təbiətdən davamlı istifadə üçün töhfələr verilməsi tələb olunur (Məmmədov, 1998).

Odur ki torpağın qorunması, onun istifadəyə yararlı vəziyyətdə saxlanılması əsasən *üç yolla* həyata keçirilə bilər.

***Birincisi,*** *tullantıların təkrar emal edilməsi və bunun üçün inkişaf etmiş ölkələrin təcrübəsindən geniş istifadə edlməsi.*

Hər il milyardlarla ton zibil atılır ki, onlar yenidən istifadə oluna və ya istilik üçün yandırıla bilər.

Zibil faydalı təkrar emal və enerji mənbəyi olsa da, cəlb olunan əl əməyinin miqdarını nəzərə alsaq, onun yığılması baha başa gəlir. İnkişaf etmiş ölkələrdə məişət və sənaye tullantıları adətən torbalara və ya qutulara yığılır, həftədə bir dəfə zibil maşınları ilə çıxarılır.

Kanalizasiya sistemləri ilk dəfə 5000 il bundan əvvəl istifadə edilmişdir və tullantıların nizamlı şəkildə atılması texnologiyaları nisbətən yenidir. İbtidai insanlar sadəcə olaraq zibil yığınlarından gələn üfunət qoxusu dözülməz hala gələndə dayanacaqlarını dəyişdilər. Daimi yaşayış məntəqələrinin sakinləri isə yandırılması mümkün olan hər şeyi yandırdılar, qalan zibil isə zibilliklərə aparılırdı.

Yığılan zibilləri atmağın ən asan yolu onu boş yerə atmaqdır. Amma böyük zibilxanalar mənzərəni korlayır və atmosferi çirkləndirir. Bundan əlavə, bir çox ərazilərdə torpaq çatışmazlığı yaşanır. Buna görə də "sanitariya zibilliyi" deyilən üsula üstünlük verilir. Tullantılar əzilir, döyülür və təbəqələrə yığılır, arasına torpaq tökülür. Torpaqda yaşayan orqanizmlər parçalanmağı sürətləndirir, sıxılma isə ağır əşyalar düşən zaman çökəkliklərin yaranmasının qarşısını alır. Bundan əlavə, sıxılma zamanı zibil həcminin azaldılması onun atılması işini çox asanlaşdırır.

Tullantıların azaldılmasının iki əsas üsulu var: *parçalama və yandırma.* Parçalama tullantıların əzilməsi və kəsilməsinin mexaniki prosesidir. Ayrı-ayrı parçalayıcılar saatda 70 tona qədər tullantı emal etmək qabiliyyətinə malikdir.

Xüsusi qurğuda 750-1000 “C” temperaturda yandırmaq zibilin miqdarını azaltmağın ən təsirli üsuludur. Bəzi yerlərdə yerli hakimiyyət orqanları istilik təchizatı üçün tullantı yandırıcılardan istifadə edirlər: bu qurğularda qızdırılan su radiatorlara verilir. Lakin zibilin yandırılması nəticəsində yaranan istiliyin heç də hamısı bu məqsədlə istifadə edilmir — onun bir hissəsi daxil olan tullantıların yandırma zavodunun əsas kamerasına verilməzdən əvvəl qurudulmasına sərf olunur. Tullantı kimi yaranan kül yanmış barmaqlıqdan aşağı düşür və çıxarılır.

Yanmanın əsas çatışmazlığı əhəmiyyətli miqdarda his və tüstü meydana gəlməsidir. Ona görə də bunu minimuma endirmək üçün zibilyandırıcı qurğuların buraxdığı zəhərli qazların və tüstünün təmizlənməsi üçün əlavə tədbirlər görülməlidir. Böyük miqdarda kağız, metal, plastik və şüşə tullantıları təkrar emal üçün istifadə olunur. Bu materialın çox hissəsi yaşayış və sənaye sahələrində ayrıca toplanır.

Bir çox çeşidləmə maşınları materialları sıxlığına görə ayırır. Məsələn, maili boşqab separatorunda daha sıx xırdalanmış tullantı materialları şaquli konveyerin dibinə sürüşür, daha az sıx olan materiallar isə yuxarıya daşınır. Yandırma sobalarında şüşə və metallar əridilir və yığıldıqları yerə axır.

Tullantılardan əsasən dəmir və alüminium kimi metallar, eləcə də az miqdarda qurğuşun, mis və civə çıxarılır. Qızılın və platinin yüksək qiymətini nəzərə alaraq, bu qiymətli metalların nisbətən az miqdarını bərpa etmək üçün böyük həcmdə metal qırıntılarının təkrar emalı iqtisadi baxımdan məqsədəuyğun hesab edilir.

***İkincisi,*** *torpaqların meliorasiyası.* Torpağın əhəmiyyətli bir hissəsini səhralar, tundralar və dağlar tutur. Bərəkətli torpaqlar hər yerdə qıtdır və dünya əhalisinin yarıdan çoxunun əkinçiliklə məşğul olduğu əkin sahələri daimi təzyiq altındadır.

Kənd təsərrüfatı torpaqlarının genişləndirilməsi iki yolla həyata keçirilə bilər.

*Birincisi* — qədim zamanlardan daşqınlara məruz qalan dəniz ərazilərindən addım-addım geri qayıtmaq. *İkinci addım* — marjinal torpaqların meliorasiyasıdır (yaxşılaşdırılması). Bu məqsədlər üçün suvarma istifadə olunur, yəni quraq ərazilərin suvarılması və ya bataqlıq ərazilərin drenajıdır.

Bəzən insanlar sənaye tullantıları və ya düzgün emal olunmamaqla torpağı yararsız hala salır, sonra isə onun yenidən həyata qaytarılması üçün tədbirlər görülməlidir.

Dənizdən torpaqların geri alınmasının diqqətəlayiq nümunəsini Hollandiya nümayiş etdirir. Ölkə ərazisinin 40 %-dən çoxu qurudulmuş dəniz dibi, şoranlıqlar və ya göllərdir.

Bataqlıq bölgəsi qamışlar və digər bataqlıq bitkiləri ilə örtülmüş bataqlıq ərazidir. Quruya daha yaxın olanda bataqlıqlar torf bataqlıqlarında, dənizə yaxın isə dəniz lil çöküntülərində yerləşir. Torpağın yeddinci hissəsini səhralar tutur, orada elə quruluq hökm sürür ki, heç bir bitki örtüyü olmur. Səhranı çiçəklənən yerə çevirməyin yeganə yolu suvarmadır.

Yaxın Şərqin kəndliləri min illərdir ki, öz torpaq sahələrini suvarırlar. Ən sadə suvarma üsulu çay və ya göldən əkin sahələrinə suvarma kanalları vasitəsilə suyun çatdırılmasıdır.

Səhraların dərinliklərində nəhəng təbii şirin su anbarları gizlənir. Məsələn, İsrailin Negev səhrasında, Sahara və Böyük Avstraliya səhrasında var.

Səthə qaldırılan su *üç yolla* paylanır. *Çiləmə sistemləri ilə* suvarma zamanı havada ucluqlarla çiləyir və yüngül yağış kimi yerə düşür. *Reaktiv suvarmada* aşağı təzyiqli su torpağın səthinə çəkilmiş borular vasitəsilə vurulur. *Yeraltı suvarma ilə* su yeraltı borular vasitəsilə birbaşa bitkilərin köklərinə axır.

Nəzarətsiz suvarma torpağın şoranlaşmasına səbəb olur. Suvarma bol olarsa və artıq suyun boşaldılması üçün heç bir yer yoxdursa, torpaq nəmlə doyurulur və alt təbəqələrdə gizlənmiş duzlar yeraltı sularla birlikdə səthə çıxarılır.

*Torpağın qorunmasının* ***üçüncü yolu,*** *sənaye məqsədləri üçün istifadədən sonra torpağın bərpasından ibarətdir.*

Mədən və açıq mədən hasilatı ətraf mühitə böyük ziyan vurur. Mədən işlərinin aparıldığı yerlərdə "ay mənzərələri" əmələ gəlir. Vaxt var idi ki, mədənlərin ətrafındakı qaya yığınlarından yüksək tullantı yığınları çıxırdı. Müasir mədən üsulları tullantıların miqdarını əhəmiyyətli dərəcədə azaldıb və köhnə tullantı yığınları tədricən aradan qaldırılır.

Açıq mədən hasilatı dayaz kömür yataqlarına çatmaq üçün yerin üst qatlarını çıxarır. Bu gün işlənmiş karxanaların yerində landşaftın rekultivasiyası aparılır. Diplər torpaqla örtülür, hamarlanır, mayalanır, ağaclar əkilir və ot səpilir.

Su eroziyasının və ya hava şəraitinin qarşısını alan torpağın mühafizəsi tədbirlərinə böyük əhəmiyyət verilir. Müasir torpağın mühafizəsi üsullarının əsasında əkin dövriyyəsinin həddindən artıq doyması, həddən artıq otlaq, bitki örtüyünün məhv edilməsi və təpələrdə uzununa şumlama kimi zərərli kənd təsərrüfatı üsullarının rədd edilməsi dayanır (Mühəndislik ətraf mühitin mühafizəsi, 2002).

*Torpağın mühafizəsinin üç əsas üsulu var:*

1) yağışların, su axınlarının və küləklərin təsirinin zəifləməsi; 2) torpağın özünün vəziyyətinin yaxşılaşdırılması; 3) münbit təbəqələri götürmədən suyun sərbəst axdığı torpaq drenajıdır.

Əkin sahələrinin çatışmazlığı olan bölgələrdə, məsələn, qayalı Maltada — terraslı əkinçilikdən də istifadə olunur. Burada torpağa o qədər qiymət verilir ki, ev tikməzdən əvvəl torpaq qatını götürüb başqa yerə aparırlar.

Bütün dünyada kontur şumları dağ yamaclarında aparılır. Təbii relyef xətlərini təkrarlayan şırımlar suyu yaxşı saxlayır.

Torpağın qorunması üçün ümumilikdə bioloji monotorinq aparılmalıdır. Buraya daxildir: bitki örtüyu, o cümlədən meşə ehtiyatlarının monitorinqi; heyvanat aləmi, o cümlədən balıq ehtiyatlarının monitorinqi; atmosfer yağıntılarının monitorinqi; radioaktivliyin monitorinqi; ətraf mühitin zərərli təsirlərinin monitorinqi; tullantıların monitorinqi; ətraf mühitin sanitar-epidemioloji monitorinqi; atmosfer havasının monitorinqi və torpaqların sanitar epidemioloji monitorinqi (Novyye Publikatsii, 2025, s. 572-586).

Hər hansı bir ölkə və yaxud şəxslər tərəfindən bilərəkdən digər ölkənin təbiətinə, flora və faunasına zərər yetirməklə, təbii sərvətlərini məhv etməklə vurulan ziyan *ekoloji terror* hesab edilir (Quliyev, 2008).

Azərbaycan Ordusunun 44 günlük zəfər döyüşlərindən sonra azad edilmiş Qarabağda və ətraf rayonlarda aparılımış təbii resursların monitorinqi göstərdi ki, 1988-ci ildən başlayaraq ermənilərin və onlara havadarlıq edən qüvvələr tərəfindən Azərbaycana qarşı başlanan müharibə, torpaqlarımızın 30 ilə yaxın işğal altında qalması ilə nəticələnən, şəhər və kəndlərin dağıdılmasına, dinc əhalinin genosidinə və eyni zamanda bitki və heyvanlar aləminin məhv edilməsinə səbəb olub.

Azərbaycanın təbiətinə xas olan landşaftlar, yüzillik ağaclar, şəlalələr, təbii mağaralar, mədəni parklar, unikal geoloji çıxıntılar və paleontoloji qatlar da məhv edilmişdir.

Biosferin mühüm hissəsini meşələr təşkil edir və bu meşələrdə müxtəlif bitki və heyvan növləri yaşayır. Ermənilər Ağdərə rayonu istiqamətində, Talış, Qazax rayonu istiqamətində, Murovdağ silsiləsi boyunca, Gülüstan və Baranbart meşələrində 100 hektarlarla sahədə saqqız, fıstıq, şam və palıd kimi çoxillik ağacları kəsmişlər.

Ermənistandan gətirilən radioaktiv tullantılar Ağdam rayonu ərazisində, işğal altındakı torpaqlarda yerləşdirilmişdir. Nüvə tullantıları Dağlıq Qarabağın 250 min hektar meşə sahəsini çirkləndirmişdir.

Ermənilər işğal olunmuş Qarabağ ərazisində geniş miqyasda narkotik bitkilər əkmiş və həmin əraziləri terror yuvasına çevirmişlər. Təmas xəttindəki rayonlarda erməni işğalçıları tərəfindən məqsədli şəkildə od vurularaq yandırma əməliyyatları həyata keçirilmişdir. Bu yanğınlar ətraf mühitə və canlı təbiətə böyük ziyan vurmuşdur (İşğal olunan ərazilərimizdə Ermənistanın ekoloji terroru).

Çox sevindirici haldır ki, Azərbaycanda da ətraf mühit və onun mühafizəsinə xüsusi diqqət yetirilir.

Xalqımızın ümummilli lideri Heydər Əliyev hakimiyyətdə olduğu bütün dövrlərdə ölkəmizdə ətraf mühitin qorunması ilə bağlı ekoloji tədbirlərin həyata keçirilməsini daim diqqət mərkəzində saxlayıb.

Heydər Əliyev yaşıllıqların qorunmasından danışarkən deyirdi: “Hər bir insan ağac əkməlidir, becərməlidir, böyütməlidir. Əgər kimsə sağlam ağacı kəsirsə, o nəinki xalqına, millətinə, ölkəsinə xəyanət edir, o öz ailəsinə, özü-özünə xəyanət edir”.

Məhz təbiətə olan həmin münasibət, ölkədə ekoloji vəziyyətin yaxşılaşdırılması istiqamətində həyata keçirilən siyasət sayəsində Azərbaycanda yeni meşələr, parklar və istirahət guşələri salınıb.

Ümummilli liderin həyata keçirdiyi ekoloji siyasət bu gün Prezident İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Ətraf mühitin, meşələrin, yaşıllıqların qorunması daim dövlətin diqqət mərkəzindədir və ekoloji təhlükəsizliyin təmin edilməsi, bioloji müxtəlifliyin qorunub saxlanılması, atmosfer havasının və su ehtiyatlarının çirklənməsinin, torpaqların deqradasiyasının qarşısının alınması ölkədə aparılan dövlətimizin ekoloji siyasətin əsas prioritetlərindəndir.

Hamıya yaxşı məlumdur ki, Birləşmiş Millətlər Təşkilatının (BMT) İqlim Dəyişikliyi Konfransları BMT-nin İqlim Dəyişikliyi haqqında Çərçivə Konvensiyası (UNFCCC) çərçivəsində hər il keçirilən konfranslardır.

2024-cü ilin noyabr ayında BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası (COP29) Azərbaycanda — paytaxt Bakıda keçirilərək uğurlu sonluqla yekunlaşdı. 80 dövlət və hökumət başçısının iştirak etdiyi, 76 mindən çox iştirakçının qatıldığı COP29-un yüksək səviyyədə təşkil olunması, eləcə də iştirakçıların ölkəmiz, xalqımız, dövlətimiz haqqında yüksək fikir söyləmələri olduqca qürurvericidir.

Bakı nailiyyətini çoxtərəfliliyin təntənəsi kimi qiymətləndirən Azərbaycan Prezidenti *"COP29-un iqlim diplomatiyasında dönüş nöqtəsi"* olduğunu bildirdi. Artıq tarix yazmış COP29-un bütün

bəşəriyyət üçün uğurla başa çatdığını qeyd edə bilər. Ən önəmlisi isə "Bakı Maliyyə Hədəfi" (Baku Finance Goal) ilə bağlı razılıq əldə olundu. Bu hədəf inkişaf etmiş ölkələrin inkişaf etməkdə olan dövlətlər üçün 2035-ci ilə qədər hər il ən azı 300 milyard dollar səfərbər etməsini nəzərdə tutur (İşğal olunan ərazilərimizdə Ermənistanın ekoloji terroru və ətraf təbii mühit, 2021).

Bu gün respublikamızda torpaq fondunun istifadəsi və mühafizəsinin dövlət tənzimlənməsi həyata keçirilir və ətraf mühitin mühafizəsi, təbiətdən istifadə və ekoloji təhlükəsizlik qaydaları əleyhinə olan inzibati və cinayət məsuliyyəti nəzərdə tutulan qanunvericilik normaları qəbul olunmuş və təbiq edilir.

Belə ki, ətraf mühitə atılan, axıdılan və ya basdırılan zərərli maddələrin miqdarının, habelə zərərli fiziki təsirlərin hədlərinin yol verilə bilən normativlərdən artıq olmasına, atmosfer havasının mühafizəsi sahəsində qanunvericiliyin pozulmasına, radioaktiv maddələrlə iş zamanı, müəssisələrin, qurğuların və başqa obyektlərin tikintisinə və yenidən qurulmasına dair ekoloji tələblərin pozulmasna, torpaqların (meşə fondu torpaqlarının) zibillənməsi və korlanması, yaşıllıqların mühafizəsi haqqında qanunvericiliyin pozulması, içməli su mənbələrinin, sutəmizləyici qurğuların, su kəmərlərinin sanitar mühafizə zonalarının tələblərinin və içməli suyun keyfiyyətinə dair tələblərin pozulmasına görə və ekologiyanını mühafizəsi ilə bağlı digər məsələlərlər üzrə Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsi (COP29-un yekunları) və Azərbaycan Respublikasının Cinayət Məcəlləsində inzibati və cinayət məsuliyyəti nəzərdə tutan müvafiq qanun normaları vardır (Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsi, 2017).

Bizim varlığımızı qoruyan təbiətdir, biz də onun qayğısına qalmalıyıq. İndiki və gələcək nəsillərin sağlamlığının təmin edilməsi, iqtisadi potensialın qorunması üçün təbii ehtiyatlardan səmərəli istifadə edilməlidir.

Odur ki biz insanlar bizi qidalandırmaqla bərabər həm də bizi qoruyan ana təbiəti, torpağın təmizliyini qorumalıyıq (Azərbaycan Respublikasının Cinayət Məcəlləsi, 2017).

## Nəticə

Torpaq insanları qida ilə, heyvanları yemlə, sənayeni isə xammalla təmin edən nəhəng təbii sərvətdir. Əsrlər və minilliklər boyu yaradılmışdır. Torpağı düzgün istifadə etmək üçün onun necə əmələ gəldiyini, quruluşunu, tərkibini və xassələrini bilmək lazımdır. Torpağın xüsusi xüsusiyyəti — münbitliyi var, bütün ölkələrdə kənd təsərrüfatının əsasını təşkil edir. Torpaq, düzgün işləməsi ilə nəinki xüsusiyyətlərini itirmir, həm də onları yaxşılaşdırır, daha məhsuldar olur. Bununla belə, torpağın dəyəri təkcə onun kənd təsərrüfatı, meşə təsərrüfatı və xalq təsərrüfatının digər sahələri üçün iqtisadi əhəmiyyəti ilə müəyyən edilmir; həm də bütün yer biosenozlarının və bütövlükdə yerin biosferinin ən mühüm komponenti kimi torpağın əvəzolunmaz ekoloji rolu ilə müəyyən edilir. Yerin torpaq örtüyü vasitəsilə yer üzündə yaşayan bütün orqanizmlərin (o cümlədən insanların) litosfer, hidrosfer və atmosferlə çoxsaylı ekoloji əlaqələri mövcuddur. Yuxarıda deyilənlərin hamısından aydın olur ki, torpağın xalq təsərrüfatında və ümumilikdə insan cəmiyyətinin həyatında rolu və əhəmiyyəti nə qədər böyük və rəngarəngdir.

Deməli, torpaqların mühafizəsi və onlardan səmərəli istifadə edilməsi bütün bəşəriyyətin ən mühüm vəzifələrindən biridir!

## Ədəbiyyat

1. *Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsi*. (2017). «Diqesta» nəşriyyatı.
2. *Azərbaycan Respublikasının Cinayət Məcəlləsi*. (2017). «Diqesta» nəşriyyatı.
3. *Coğrafiya – 11*. Elektron Dərslik Portalı. http://e-derslik.edu.az
4. COP29-un yekunları. *Xalq qəzeti.* az https://xalqqazeti.az
5. *İşğal olunan ərazilərimizdə Ermənistanın ekoloji terroru*. Azərbaycan Respublikası Müdafiə Nazirliyi. https://mod.gov.az
6. *İşğal olunan ərazilərimizdə Ermənistanın ekoloji terroru və ətraf təbii mühit*. (2021). https:mod.gov.az/az/pre/38440.html
7. Quliyev, R. M. (2008). Y*erquruluşu. Torpaq bazari və torpaq ehtiyatlarinin idarə edilməsi*. II cild. MBM.

8. Lazutkina, Yu. S., & Somin, V. A. (2007). *Ümumi ekologiya.*
9. Moiseyev, N. N. *Ekologiya v sovremennom mire*. den-za-dnem.ru
10. Məmmədov, Q. Ş. (1998). *Azərbaycan torpaqlarının ekoloji qiymətləndirilməsi*. Elm.
11. Mühəndislik ətraf mühitin mühafizəsi. (2002). *Suyun təmizlənməsi tullantılarının utilizasiyası*. İnşaat Universitetləri Birliyinin nəşriyyatı.
12. *Novyye Publikatsii.* (2025). https://www.den-za-dnem.ru
13. Səlimova, M. Ə., Şahpələngov, B., Babayev, Ə. (2012). *Mühəndis ekologiyası* (dərslik). Azərbaycan Dövlət Neft Akademiyası.
14. Torpağın sanitar mühafizəsi. *ATU Sağlamlıq jurnalı*. saqlamliq.az https://www.saqlamliq.az

Daxil oldu: 07.10.2024
Baxışa göndərildi: 01.12.2024
Təsdiq edildi: 01.02.2025
Çap olundu: 22.02.202

## RİYAZİYYAT VƏ MEXANİKA ELMLƏRİ

## MATHEMATICAL AND MECHANICAL SCIENCES

https://doi.org/10.36719/2663-4619/111/186-189

**Səbinə Bəşirova**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
https://orcid.org/0009-0001-1964-7221
bashirova.sabina310889@gmail.com

# Diferensial operatorlar üçün spektral analizin düz və tərs məsələləri

**Xülasə**

Diferensial operatorlar üçün spektral analiz düz və tərs spektral məsələləri əhatə edir. Düz spektral məsələdə operatorun spektri və öz funksiyaları təyin edilir, tərs spektral məsələdə isə verilmiş spektral məlumatlardan istifadə edərək operatorun quruluşu bərpa olunur. Şturm-Liuvill operatorları spektral analizdə mühüm rol oynayır və onların tətbiqləri kvant mexanikası, optika və mühəndislikdə geniş yayılmışdır. Tərs spektral məsələlərin həlli üçün Borg teoremi və Gel'fand-Levitan-Marchenko inteqral tənliyi kimi üsullar tətbiq olunur. Ümumiyyətlə, spektral analiz riyaziyyatın funksional analiz, kvant fizikası və tətbiqi riyaziyyat sahələrində fundamental əhəmiyyət kəsb edir.

***Açar sözlər:*** *diferensial operator, spektral analiz, düz spektral məsələ, tərs spektral məsələ,Şturm-Liuvill operatoru, özqiymət və özfunksiyalar, spektral funksiyalar, Gel'fand-Levitan-Marchenko tənliyi*

**Sabina Bashirova**
Academy of Public Administration under the President of the Republic of Azerbaijan
https://orcid.org/0009-0001-1964-7221
bashirova.sabina310889@gmail.com

# Direct and Inverse Problems of Spectral Analysis For Differential Operators

**Abstract**

Spectral analysis for differential operators covers direct and inverse spectral problems. In the direct spectral problem, the spectrum and eigenfunctions of the operator are determined, while in the inverse spectral problem, the structure of the operator is reconstructed using the given spectral data. Sturm-Liouville operators play an important role in spectral analysis and their applications are widespread in quantum mechanics, optics, and engineering. Methods such as Borg's theorem and the Gel'fand-Levitan-Marchenko integral equation are used to solve inverse spectral problems. In general, spectral analysis is of fundamental importance in the functional analysis, quantum physics, and applied mathematics fields of mathematics.

***Keywords:*** *differential operator, spectral analysis, direct spectral problem, inverse spectral problem, Sturm-Liouville operator, eigenvalues and eigenfunctions, spectral functions, Gel'fand-Levitan-Marchenko equation*

## Giriş

Spektral analiz riyaziyyatın funksional analiz və diferensial tənliklər sahəsində mühüm istiqamətlərdən biridir. Bu analiz diferensial operatorların xassələrini öyrənməyə və onların spektral xarakteristikalarını təyin etməyə imkan verir.

Diferensial operatorların spektral analizi riyazi fizika, kvant mexanikası və mühəndislik tətbiqlərində mühüm yer tutur. Spektral analiz, operatorların spektrinin, özfunksiyalarının və onların

xassələrinin araşdırılmasına yönəlib. Bu proses iki əsas məsələyə bölünür: düz spektral məsələ və tərs spektral məsələ (Kato, 1995).

**Tədqiqat**

Düz spektral məsələ verilmiş bir diferensial operatorun spektrinin (özqiymətlərin) və ona uyğun özfunksiyaların tapılmasını nəzərdə tutur. Bu, aşağıdakı əsas addımları əhatə edir (Eckhardt, Gesztesy, Teschl, 2013):

1. Spektral xarakteristikanın təyini – Diferensial operatorun spektrinin quruluşu araşdırılır.
2. Özfunksiyaların və özqiymətlərin tapılması – Operatorun spektral göstəricilərinin təyin olunması üçün sərhəd şərtləri nəzərə alınaraq uyğun diferensial tənliklər həll edilir.
3. Spektral ölçü və ortogonal genişlənmə – Tapılmış özfunksiyalar əsasında spektral genişlənmə ifadələri qurulur.

Tərs spektral məsələ verilmiş spektral məlumatlara əsasən diferensial operatorun müəyyən edilməsini hədəfləyir. Burada əsas məqsəd spektral xarakteristikalara görə operatorun strukturunu bərpa etməkdir (Naimark, 2010).

Tərs spektral məsələlər aşağıdakı hallarda tətbiq edilir:

Spektral məlumatlardan potensialın bərpası – Məsələn, Şturm-Liuvill operatoru üçün potensial funksiyanın spektral xarakteristikalar vasitəsilə müəyyən edilməsi.

Kvant mexanikasında tərs məsələlər – Kvant sistemlərinin enerji spektri vasitəsilə potensialın təyini (Simon, 1995).

Tətbiqi riyaziyyatda və mühəndislikdə – Vibrasiya sistemlərində kütlə və sərtlik parametrlərinin spektral məlumatlar əsasında müəyyən edilməsi.

Düz və tərs spektral məsələlər diferensial operatorların öyrənilməsində fundamental rola malikdir. Düz spektral analiz operatorun spektral xassələrini tapmağa kömək edirsə, tərs spektral analiz isə bu xassələrdən istifadə edərək operatorun quruluşunu müəyyən etməyə imkan yaradır (Titchmarsh, 1946).

Bu sahə riyaziyyatın nəzəri və tətbiqi aspektlərində geniş istifadəyə malikdir və xüsusilə kvant mexanikası, optika, nəzarət nəzəriyyəsi kimi sahələrdə mühüm əhəmiyyət kəsb edir.

Riyazi olaraq, bu, aşağıdakı ümumi diferensial tənlik formasında ifadə olunur (Levitan, Sargsyan, 1975):

$$L y = \lambda y$$

burada diferensial operator, funksiyası operatorun özfunksiyası, isə özqiymətdir.

Düz spektral məsələnin əsas komponentləri bunlardır (Albeverio, Høegh-Krohn, 1993):

1.1. Spektrin təyini

Xüsusi hallar: Diferensial operatorun spektri diskret və ya kəsilməz ola bilər.

Özqiymət və özfunksiyalar: Şturm-Liuvill tipli operatorlar üçün bu anlayışlar mühüm rol oynayır.

Spektral ölçü və spektral funksiyalar: Bu anlayışlar Hilbert fəzasında spektral nəzəriyyənin əsasını təşkil edir (Marchenko, 1986).

1.2. Ortogonal genişlənmə və Fourier tipli analiz

Spektral analiz, Fourier seriyalarına bənzər şəkildə funksiyaların operatorun özfunksiyaları üzrə genişləndirilməsinə imkan yaradır. Şturm-Liuvill operatorları üçün genişlənmə aşağıdakı formada olur (Freiling, 2009):

$$f(x) = \sum_{n=1}^{\infty} c_n y_n(x)$$

burada operatorun özfunksiyaları, isə Fourier əmsallarına oxşar şəkildə təyin olunan genişlənmə əmsallarıdır.

1.3. Şturm-Liuvill operatoru üçün düz spektral məsələ

Şturm-Liuvill operatoru spektral analizdə əsas obyektlərdən biridir və aşağıdakı şəkildə verilir (Borg, 1946):

$$\left( p(x) y' \right)' + \left( q(x) + \lambda w(x) \right) y = 0$$

bu operator üçün:

Sərhəd şərtləri təyin olunur (Dirixle, Noyman və s.); Özqiymətlərin asimptotik davranışı araşdırılır. Spektral funksiyalar hesablanır.

Düz spektral məsələlər fizikanın müxtəlif sahələrində, xüsusilə kvant mexanikasında Schrödinger tənliyi üçün istifadə olunur.

Tərs spektral məsələ verilmiş spektral xarakteristikalara əsasən diferensial operatorun müəyyən edilməsini hədəfləyir. Yəni, operatorun spektri məlum olduqda, onun tərs qurulması məsələsi həll edilir (Gelfand, Levitan, 1951).

2.1. Problem formulasiyası

Əgər düz spektral məsələdə operator məlum olub spektr tapılırsa, tərs spektral məsələdə əksinə, spektral məlumatlar məlum olur və operatorun özü bərpa edilir. Bu, ümumiyyətlə, aşağıdakı formada təqdim edilir (Babbitt, 1999):

L y = \lambda y, \quad \lambda \text{ və } y(x) \text{ məlumdur, } L \text{ tapılmalıdır.}

Əsas məqsəd operatorun potensial funksiyasını tapmaqdır.

2.2. Tərs Şturm-Liuvill problemi

Şturm-Liuvill operatorları üçün tərs spektral məsələnin həlli çox vacibdir. Əsas məqsəd verilmiş spektral xarakteristikalar (özqiymətlər və normalizasiya əmsalları) əsasında potensial funksiyanı müəyyən etməkdir.

Borg teoremi: Bir çox hallarda spektr operatoru tam bərpa edir (Berezin, Shubin, 1991).

Gel'fand-Levitan-Marchenko inteqral tənliyi: Bu tənlik tərs spektral məsələnin həlli üçün istifadə olunur.

2.3. Kvant mexanikasında tətbiqlər

Kvant mexanikasında Schrödinger tənliyinin potensialı spektral məlumatlardan istifadə olunaraq tapılır:

- \frac{d^2 \psi}{dx^2} + V(x) \psi = E \psi

Burada enerji səviyyələri (spektr) isə dalğa funksiyasıdır. Spektr məlum olduqda, potensial bərpa edilə bilər.

2.4. Tərs məsələlərin riyazi əhəmiyyəti

Tətbiqi riyaziyyatda: Vibrasiya və dalğa nəzəriyyəsində geniş istifadə olunur.

Tibbi tomoqrafiyada: Tərs spektral analiz tibb sahəsində, məsələn, kompyuter tomoqrafiyasında istifadə edilir (Reed, Simon, 1978).

Geofizikada: Yer qabığının quruluşunu öyrənmək üçün spektral məlumatlardan istifadə edilir.

**Düz və tərs spektral məsələlərin qarşılıqlı əlaqəsi**

Düz və tərs spektral məsələlər bir-biri ilə sıx bağlıdır. Düz spektral analiz operatorun spektrini və özfunksiyalarını tapmağa kömək edirsə, tərs spektral analiz isə bu xassələrdən istifadə edərək operatorun quruluşunu müəyyən etməyə imkan yaradır. Aşağıdakı cədvəldə onların əsas fərqləri göstərilir (Courant, Hilbert, 1989):

## Nəticə

Diferensial operatorların spektral analizi, həm düz, həm də tərs məsələlərin araşdırılmasını əhatə edir və riyaziyyatın müxtəlif sahələrində mühüm rol oynayır. Düz spektral məsələdə məqsəd operatorun spektrini və uyğun özfunksiyaları tapmaqdır, bu isə funksional analiz və kvant mexanikasında vacib tətbiqlərə malikdir. Tərs spektral məsələ isə verilmiş spektral məlumatlar əsasında operatorun strukturu ilə bağlı məlumat əldə etməyə yönəlir. Şturm-Liuvill tipli operatorlar bu sahədə əsas nümunələrdən biridir və onların təhlili kvant mexanikası və digər fiziki sahələrdə tətbiq olunur. Bu analizlər, həmçinin mühəndislik və tibbi riyaziyyat kimi sahələrdə tətbiq olunan problemlərin həllində də istifadə olunur. Ümumiyyətlə, spektral analiz diferensial operatorların xassələrini öyrənmək və müxtəlif tətbiqi sahələrdə operatorların bərpasını təmin etmək üçün vacib bir alətdir.

## Ədəbiyyat

1. Albeverio, S., & Hoegh-Krohn, R. (1993). *An Introduction to Spectral Theory: With Applications to Schrödinger Operators*. Springer.
2. Borg, G. (1946). *A Uniqueness Theorem in the Theory of Second Order Linear Differential Equations*. Acta Mathematica.

3. Berezin, F. A., & Shubin, M. A. (1991). *The Schrödinger Equation*. Kluwer Academic Publishers.
4. Babbitt, W. M. (1999). *Spectral Theory of Differential Operators*. Cambridge University Press.
5. Courant, R., & Hilbert, D. (1989). *Methods of Mathematical Physics*. Wiley.
6. Eckhardt, J., Gesztesy, F., & Teschl, G. (2013). Inverse Spectral Theory for Sturm-Liouville Operators with Distributional Potentials. *Journal of Functional Analysis*.
7. Freiling, M. (2009). *Spectral Theory and Differential Operators*. CRC Press.
8. Gelfand, I. M., & Levitan, B. M. (1951). *On the Determination of a Differential Equation from Its Spectral Function*. Izvestiya Akademii Nauk SSSR.
9. Kato, T. (1995). *Perturbation Theory for Linear Operators*. Springer.
10. Levitan, B. M., & Sargsyan, I. S. (1975). *Introduction to Spectral Theory: Selfadjoint Ordinary Differential Operators.* American Mathematical Society.
11. Marchenko, V. A. (1986). *Sturm-Liouville Operators and Applications*. American Mathematical Society.
12. Naimark, M. A. (2010). *Linear Differential Operators*. Dover Publications.
13. Reed, M., & Simon, B. (1978). *Methods of Modern Mathematical Physics IV: Analysis of Operators*. Academic Press.
14. Simon, B. (1995). *Spectral Analysis of Rank One Perturbations and Applications*. American Journal of Mathematics.
15. Titchmarsh, E. C. (1946*). Eigenfunction Expansions Associated with Second-order Differential Equations*. Oxford University Press.

Daxil oldu: 15.10.2024
Baxışa göndərildi: 18.12.2024
Təsdiq edildi: 29.01.2025
Çap olundu: 22.01.2025

# TEXNİKA ELMLƏRİ

# TECHNICAL SCIENCES

https://doi.org/10.36719/2663-4619/111/190-193

**Rahim Rahimli**
Khazar University
https://orcid.org/0009-0005-2061-6093
UOT 005:004
rehim4028@gmail.com

## Ensuring the Protection of Personal Data As an Element of Information Security

**Abstract**

The article considers the legal regulation of personal data protection as an important element of information security, highlighting its critical importance in the modern digital landscape. The study examines the relevance of addressing the challenges associated with safeguarding personal data, presenting examples of emerging threats that have exacerbated the risks of data leakage. It identifies key measures, including legal frameworks, technological solutions, and organizational strategies, that contribute to strengthening the protection of personal data. Additionally, the article discusses the broader implications for organizations and individuals, emphasizing the necessity of proactive approaches to mitigate risks and enhance information security.

***Keywords:*** *information security, personal data protection, protection, information, legal regulation*

**Rəhim Rəhimli**
Xəzər Universiteti
https://orcid.org/0009-0005-2061-6093
UOT 005:004
rehim4028@gmail.com

## İnformasiya təhlükəsizliyinin unesenti kimi şəxsi məlumatların mühafizəsinin təmin edilməsi

**Xülasə**

Məqalədə fərdi məlumatların mühafizəsinin hüquqi tənzimlənməsi informasiya təhlükəsizliyinin mühüm elementi kimi nəzərdən keçirilir, onun müasir rəqəmsal mənzərədə kritik əhəmiyyəti vurğulanır. Tədqiqat şəxsi məlumatların qorunmasının gücləndirilməsinə töhfə verən hüquqi bazalar, texnoloji həllər və təşkilati strategiyalar da daxil olmaqla əsas tədbirləri müəyyən edir. Bundan əlavə, məqalədə risklərin azaldılması və informasiya təhlükəsizliyinin artırılması üçün proaktiv yanaşmaların zəruriliyi vurğulanaraq təşkilatlar və fərdlər üçün daha geniş təsirlər müzakirə edilir.

***Açar sözlər:*** *informasiya təhlükəsizliyi, fərdi məlumatların mühafizəsi, mühafizə, məlumat, hüquqi tənzimləmə*

### Introduction

Digital development is an undisputed catalyst for global progress. At the same time, global digitalization, the Internet, mobile communications, computer technologies, and the possibilities of scientific and technical achievements in this area inevitably give rise to risks and threats.

 

Ensuring information security and protecting personal data has recently become one of the key tasks not only on a global scale, but also within any state and organization.

At the international level, the mechanism for protecting personal data is reflected in the principle of privacy. The corresponding principle is contained in the International Covenant on Civil and Political Rights, which establishes that no one shall be subjected to arbitrary or unlawful interference with the inviolability of his home or the privacy of his correspondence, or to unlawful attacks on his honor and reputation (International Covenant on Civil and Political Rights).

**Research**

There are two main approaches to defining personal data in foreign legislation. Firstly, in some countries, personal data are identified with any information related to a given person (the Netherlands, Sweden, New Zealand, etc.). Secondly, some countries are characterized by detailing, establishing certain criteria for classifying information into a specified category (Great Britain, etc.). At the same time, the optimal regulation option is considered to be the presence of a carefully verified and legally secured balance of two basic information rights and freedoms: the right to access information affecting the interests of a person, and the right to restrict third parties' access to information about themselves (Dvoretsky & Chernyshova, 2007, pp. 12-13).

The European Union has developed and adopted provisions governing the protection of personal data, enshrined in the GDPR (General Data Protection Regulation). In accordance with this document, the rights of personal data subjects have been significantly expanded, while the obligations of operators and fines for failure to comply have increased significantly. The definition of personal data in the GDPR itself has the following content: "any information relating to an identified or identifiable natural person ("data subject"); an identifiable natural person is one who can be identified, directly or indirectly, in particular by reference to an identifier such as a name, surname, identification number, location data, online identifier or to one or more physical, physiological, genetic, mental, economic, cultural or social identity factors specific to that person."

At the same time, the leakage of personal data remains at a high level (Regulation (EU) 2016/679 of the European parliament and of the council, 2016).

At the same time, the problem is exacerbated by the emergence of modern challenges.

As an example of the emerging threat of a breach of personal data security, the following can be noted.

During the spread of the new coronavirus infection COVID-19, global changes occurred in the public life of people. Thus, many employers, in order to maintain the stability of their activities, were forced to transfer employees to a remote work mode, educational institutions organized distance learning opportunities, etc. Such specifics of work require strengthening information security in terms of protecting personal data, which presupposes the availability of reliable communication channels and sufficient material resources for the transition process (Data Protection and Privacy in the Digital Age. Research paper discussing global trends in personal data protection, 2021; OECD Guidelines on the Protection of Privacy and Transborder Flows of Personal Data. Framework for protecting privacy, 2013).

The blurring of boundaries between corporate and personal devices, corporate and personal data, due to the fact that many employees work from home on their personal laptops and computers, a priori reduces the level of information protection (General Data Protection Regulation (GDPR) Overview. European Union's regulation on data protection and privacy, 2016).

At the same time, almost all organizations have encountered attempts to "leak" information during the period of remote work – both intentional (collusion of employees with attackers) and unintentional. For example, there were cases when employees received a mailing allegedly from the HR department of their company with information about dismissal in connection with the decision of the manager to optimize the staff in difficult pandemic conditions, and they were offered to find out more detailed information in an infected file attached to the letter or by clicking on a link to a site that steals personal data. Both the employees themselves, whose personal data was leaked to third parties, and the companies that received local and network infections in this way suffered damage

